

**Hörmətli oxucu!**

18 bədii və elmi kitab müəllifi olan Şahin Fazil Fərzəlibəyli otuz ildən artıqdır ki, Azərbaycanın qonşu ölkələrlə olan siyasi, ictimai-iqtisadi, mədəni və diplomatik münasibətləri tarixini tədqiq edir. O, ölkəmizdə və xaricdə keçirilən onlarla elmi konfrans və görüşlərin iştirakçısı olmuş, qələmindən Azərbaycanın iki yüz illik (XV-XVI əsrlər) tarixinə dair iki yüzdən çox elmi məqalə çıxmışdır.

Sizə təqdim olunan bu kitab tarix elmləri doktoru Şahin Fazil Fərzəlibəylinin növbəti monoqrafik əsəridir.

**Şahin Fazil Fərzəlibəyli**

# XV ƏSR AZƏRBAYCAN DÖVLƏTLƏRİNİN QURULUŞU

**Şahin Fazil Fərzəlibəyli**

# XV ƏSR AZƏRBAYCAN DÖVLƏTLƏRİNİN QURULUŞU

(Təkmilləşdirilmiş II nəşri)

**Bakı-2003**

**Azərbaycan Respublikası Təhsil Nazirliyinin 04.03.2003-cü il 193 saylı qərarı ilə çap olunur.**

ELMİ REDAKTORU: *Tarix elmləri doktoru, professor*
**Yaqub Mahmudlu**

RƏYÇİLƏR: *Tarix elmləri doktoru, professor*
**V.Piriyev-Buduqlu**

*və tarix elmləri doktoru, professor*
**T.Mustafazadə**

**Fərzəlibəyli Şahin Fazil. XV əsr Azərbaycan dövlətlərinin quruluşu. Bakı, "Elnur-P"-2003. 118 səh.**

*Monoqrafiyada XV əsr Azərbaycan dövlətlərinin (Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar) quruluşuna elmi nəzər salınmış, ölkəmizin həmin dövrdəki siyasi quruluşuna, mərkəzi və yerli idarəetmə orqanlarına, hərbi quruluş və məhkəmə sisteminə, dövr iqtisadiyyatının əsas xüsusiyyətlərinə, habelə insan hüququnun inkişafında əsas cəhətlərə diqqət yetirilmişdir.*

Ş $\frac{\text{M-001256}}{\text{700122}}$ -2003



## MÜƏLLİFDƏN

*Bu kitabın çapından bir neçə gün sonra bəzi elmi işçilər və alim həmkarlarımdan giley-güzar eşitdim. Onlar əsərdə iqtibasların (istifadə etdiyim mənbə və ədəbiyyatın) olmamasını mənə irad tutur, imkan daxilində əsərimin yeni nəşrini hazırlamağımı tövsiyə edirdilər.*

*Doğrusu, mən bu kitabı istinad etdiyim iqtibaslarla birlikdə Azərbaycan Təhsil Nazirliyinə təqdim etmişdim, lakin təəssüf ki, Metodiki Şuranın tövsiyəsi ilə həmin iqtibasları ixtisar etməli oldum. Buna görə də, XV əsrdə Qaraqoyunlu, Ağqoyunlu, Şirvanşahlar kimi Azərbaycan feodal dövlətlərinin quruluşuna həsr etdiyim əsər iqtibas və çıxarışlarsız çap olundu.*

*İndi isə, hörmətli tələbələr, elmi işçilər və alim həmkarlarım, mən həmin əsəri bir qədər geniş variantda, özü də istifadə etdiyim mənbə və ədəbiyyatı göstərməklə sizə təqdim edirəm.*

**Şahin Fazil Fərzəlibəyli**

# GİRİŞ

Ana Yer Kürəmizin müxtəlif bölgələrində dövlətlərin mövcud olduqları tarixi dövrlərdən başlamış bu günlərədək dövlət quruluşunun necəliyi və necə olma zərurəti barədə cildlərlə əsər yazılmış, müxtəlif misallar gətirilmiş, fərziyyələr irəli sürülmüş, bu və ya digər dövlətin təşəkkülü və süqutunda tarixi gerçəklik və zərurət nəzərə çatdırılmışdır. Əlbəttə, bütün bunların müxtəlif ölkələrin mütəfəkkirləri tərəfindən uzun əsrlər boyu diqqətlə araşdırılmasına baxmayaraq, məzkur mövzu bu gün də, gələcəkdə də mühüm tədqiqat obyekti kimi öyrəniləcəkdir.

XV əsrin əhatə etdiyi dövr Azərbaycan tarixində üç feodal dövlətin - Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin fəaliyyətdə olmaları ilə səciyyələnir. Mövzu ilə əlaqədar bir sıra ölkə tədqiqatçıları tərəfindən müəyyən fikir və mülahizələr söylənilmiş, həmçinin məqalələr yazılmışdırsa da bunun hələ kifayət olmadığı zənnindəyəm.

Dövlət quruluşu məsələsi dövləti olan bütün ölkələrə xas ən aktual məsələlərdən biridir, çünki hər hansı bir dövlətin inkişafı və davamlılığı məhz onun quruluşunun mahiyyətindən asılı problemdir, çünki dövləti yaşadan da, məhv edən də onun quruluşudur. Mövzunun şərhinə başlamazdan əvvəl biz müxtəsər şəkildə XV əsrə qədər Azərbaycan ərazilərində mövcud olmuş dövlətlər və onların quruluşu barədə məlumat verməyi məqsədəuyğun sayırıq.

İbtidai icma cəmiyyətində siniflər olmadığından, təbii ki, dövlət də olmamışdır. Tarixən bir-biri ilə təzad təşkil edən siniflərin mövcudluğu dövründə yaranan dövlət isə uzun əsrlər boyu cəmiyyətin idarə olunmasında əsas siyasi hakimiyyət aləti olmuşdur.

**Dövlətin ümdə əlamətləri özündə aşağıdakı xüsusiyyətləri ehtiva edir:**

1. Xüsusi orqanlar və idarə sisteminin mövcudluğu;
2. Hüquq, yəni dövlət tərəfindən müəyyən olunan və təsdiq edilən məcburi davranış qaydaları;
3. Müəyyən əraziyə malik olmaq.



Hər bir sinfi ictimai-iqtisadi formasiyanın məzmununa uyğun olaraq hər hansı dövlətin müəyyən tarixi tipi olmuşdur – quldarlıq, feodal, burjua və s. E.ə. IV-III minilliklərdə mövcud olmuş quldarlıq quruluşu cəmiyyətin inkişafı ilə əlaqədar feodal quruluşu əvəz etmiş və dövlət feodal sinfinin diktaturası kimi fəaliyyət göstərmişdir. Azərbaycanda da təbii ki, feodal dövlətləri qurulmuş, tərəqqi və tənəzzül mərhələsi keçmiş, son nəticədə süquta uğramışdır. Azərbaycan feodal dövlətlərində idarəçilik forması mütləq monarxiya idi.[1] Bu idarəçilik forması aşağıda mufəssəl bəhs edəcəyimiz XV əsr Azərbaycan Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinə də xas olmuşdur ki, bu barədə öz növbəsində məlumat verəcəyik.

Məlum olduğu kimi, eradan əvvəl IX əsrdə Ön Asiyanın qədim tarixində böyük rol oynamış Amaday vilayətində (Gizilbundadan şərq və Zigertudan cənub-şərq istiqamətində Qızılüzən çayının vadisində yerləşən geniş bir məkan) sakin olan amaday tayfa ittifaqı Mada (Amadai) xalqının əsası, ölkə isə gələcək Mada çarlığının özəyi oldu. O vaxtlarda Azərbaycan ərazisində başqa xırda siyasi vahidlər də var idi. Məsələn «Ninni və Haruna» çarlıqları. E.ə. IX əsrin II yarısından etibarən Urmiyaboyu yerlərdə tədricən Manna çarlığının konturları görünməyə başlayır, e.ə. VIII əsrdə Manna artıq siyasi və beynəlxalq münasibətlərdə mühüm amilə çevrilir. Bu çarlıq Azərbaycan ərazisində yaranan ilk iri dövlət qurumu hesab edilir.[2] Onu da qeyd etmək lazımdır ki, «Manna birləşməsi qədim ənənələri olan bir ərazidə, qədim tarixin çox böyük bir kəsiyində iqtisadi və mədəni cəhətdən öndə gedən bir rayonda meydana gəlmişdi»[3]

«Çar şəhəri» adlanan İzirtu uzun müddət Manna çarlığının paytaxtı olaraq qaldı. Manna Azərbaycan ərazisində ilkin sinfi cəmiyyəti olan ölkə idi və orada çar hakimiyyəti çox güclü idi. Manna çarı Ullusunu dövründə dövlət çardan başqa

---

[1] Azərbaycan Sovet Ensiklopediyası, III cild, Bakı, 1979, səh.513-514.
[2] Azərbaycan tarixi, I cild. «Elm» nəşriyyatı, Bakı,1998, səh.180-182.
[3] Yenə orada, səh. 182.

ağsaqqallar, müşavirlər, şahzadələr, canişinlər və başqa görkəmli əyanlar tərəfindən idarə olunurdu. Mannada nəsli əyanlar, habelə hərbi və xidmətçi əyanlar silki güclü idi. Çar hakimiyyətinin qəbilə-tayfa başçısının hökmranlığından törənməsinə baxmayaraq, artıq e.ə. VIII əsrdə bu hakimiyyət irsi olmuşdu və bu çarlıq çar canişinləri tərəfindən idarə olunan mahallara bölünürdü. Tayfa hakimləri Mannanın inzibati həyatında böyük rol oynayırdılar.[4]

E.ə. VII əsrdə isə Azərbaycandan şərqə və cənub-şərqə doğru yerləşən bir sıra vilayətlərdə artıq Mada tayfa ittifaqı təşəkkül tapmaqda idi. Tez bir müddətdə olduqca güclənən madalılar sakin olduqları yerləri çarlığa və imperiyaya çevirməyə nail oldular, başqa dövlətlərlə yanaşı Mannanı da işğal etdilər. Beləliklə Madanın bir hissəsinə çevrilmiş Manna da «Mada», yaxud «Kiçik Mada» adlanmağa başladı.

Madanın dövlət quruluşuna nəzər salsaq məlum olur ki, dövləti çar, satraplar (hakimiyyət qoruyucuları) və əyanlar, habelə maqlar-kahinlər idarə edirdilər. Dini cəhətdənsə ölkədə Avesta təlimləri olduqca geniş yayılmışdı.[5]

E.ə. 550-ci ildə madalılar farslar tərəfindən süquta uğradıldı və onlar öz dövlət müstəqilliklərini itirib farsların hakimiyyəti altına düşdülər, Mada çar Kuruşun yaratdığı Həxamənşi imperiyasında bir satraplığa çevrildi.[6]

E.ə. IV əsrin ortalarında isə Azərbaycan ərazisində həxamənşi hökmranlığının zəifləməsi nəticəsində müstəqil Mada-Atropatena, yaxud Kiçik Mada dövləti yarandı.[7]

Bu dövlət atropatilər tərəfindən idarə olunurdu.[8]

Atropatenanın süqutundan sonra Azərbaycanın əsasən şimal vilayətlərində yaşayan xalqların tarixi artıq Albaniya və albanlar (antik mənbələrdən məlum olan ölkə və xalq adı) tarixi adlanaraq elmi və kütləvi ədəbiyyata daxil edilmişdir. Bir çox hallarda bu ölkəni «Qafqaz Albaniyası» da

[4] Yenə orada. səh.198-199.
[5] Azərbaycan tarixi, I cild, səh.228-236.
[6] Yenə orada, səh.239.
[7] Yenə orada, səh,252.
[8] Yenə orada, səh.301.



adlandırırlar. Strabona görə albanlar «iberlərlə Kaspi dənizi arasında» yaşayırdılar, Ptolomeyə görəsə Albaniya «şimalda Sarmatiyanın bir qismi ilə, qərbdə İberiya ilə, cənubda Böyük Ermənistanın bir qismi ilə» həmsərhəd idi.[9]

İnzibati ərazi baxımından Albaniya vilayətlərə – qavar və əyalətlərə (nəhənglərə) bölünürdü. Ölkədə quldarlıq və feodal ukladları mövcud idi. Başlıca siniflər azatlar (feodallar) və şinakanlar (kəndlilər) adlanan təbəqələr əsasında formalaşmışdı. Vilayətlər hökmdar tərəfindən təyin edilən «nahararlar» vasitəsi ilə idarə olunurdu. Alban hökmdarı ölkənin qanunverici və ali hakimi idi. Albaniyada «Qaxnamak» («Dərəcələr fərmanı») adlı hüquqi sənəddə əks olunmuş feodal iyerarxiyası mövcud idi. Ölkədə əsasən xristianlıq yayılmışdı.[10] III-IV əsrlərdə Albaniyada aşağıdakı torpaq sahibliyi formaları vardı:

1. Torpaq üzərində dövlət mülkiyyəti;
2. Atadanqalma (aqnatik) torpaq mülkiyyəti;
3. Hökmdar domeni;
4. Xüsusi feodal torpaq mülkiyyəti;
5. Kilsə torpaq mülkiyyəti;
6. Kəndli və icma torpaq mülkiyyəti.[11]

Alban cəmiyyəti I-IV əsrlərdə Arşaqi sülaləsindən olan hökmdarlar, VII əsrdən isə Mihranilər xanədanına mənsub böyük knyazlar tərəfindən idarə olunurdu. İdarəçilikdə mərkəzləşmə üstün olduğuna görə dövlətçiliyin rolu yüksəlmişdi. Hökmdar dünyəvi və dini hakimiyyətin məşvərətçi və qanunverici orqanı olan məhkəməyə başçılıq edirdi. Ölkənin əsas idarəçilik vəzifələri hazarapet (minbaşı), hramanatar (güman ki, baş vəzir) və sparapet (ölkənin bütün hərbi quvvələrinin baş komandanı) idi. Adı sonuncu çəkilən vəzifə yalnız ölkədə hökmdar hakimiyyətinin olmadığı dövrdən – VII əsrdən qeydə alınmışdır. Məsələn, mənbələrdə böyük knyaz Cavanşir Albaniya sparapeti kimi təqdim

[9] Yenə orada, səh.328.
[10] Azərbaycan tarixi, II cild, «Elm» nəşriyyatı, Bakı, 1998, səh.15-39.
[11] Yenə orada, səh.39.

olunurdu. Böyük knyaz Varaz Tiridat isə baş komandan «zoravar» (fars termini «zuravər» - zor sahibi – Ş.F.) istilahı ilə qeyd olunmuşdur. Bu vəzifəni Mehranilər dövründə həm böyük knyazlar, həm də başqa şəxslər tuta bilərdilər.[12] Albaniya dövləti ilk alban hüquqi sənədi – girişdən və 21 maddədən ibarət Aquen qanunları ilə idarə olunurdu. Bu qanunlar dörd qrupa bölünürdü:

1. Ruhanilərə aid olan qanunlar;

2.Ruhanilərlə dünyəvi əyanlar arasında olan münasibətləri tənzimləyən qanunlar;

3. Ruhanilərlə dünyəvi əhali arasındakı münasibətləri tənzimləyən qanunlar;

4. Sırf hüquqi səciyyə daşıyan qanunlar.

lll-Vll əsrlərdə Azərbaycan (Adurbadaqan) isə İran Sasanilər dövlətinin tərkibində bir vilayət kimi fəaliyyət göstərirdi. Sasani vilayətlərinin hakimləri «şəhriyar» (şəhər sahibləri), əyalətlərininki isə «payqospan» (tərəfləri, ətrafı qoruyanlar) adlanırdı. Dövlət mülkiyyəti işlərini ostandarlar və maliyyə məmurları olan amargarlar, kilsə və məhkəmə işlərini isə möbidlər və radlar idarə edirdilər. Hökmdar xəzinəsinin əmlakına nəzarət edən, vergi və mükəlləfiyyətləri təyin edib toplayan dövlət qulluqçuları – amargarlar etibarlı dövlət qulluqçuları sayılırdılar.

Sinfi quruluşuna görə əhali dörd zümrəyə bölünürdü: 1. Kahinlər; 2. Döyüşçülər; 3. Katiblər; 4. Vergi verənlər.

Qullar heç bir zümrəyə aid deyildilər. Torpaq mülkiyyətinin bir neçə növü mövcud idi: icma torpaqları, sahibkar torpaqları, feodalların irsi torpaqları, məbəd və şəhər torpaqları. Xüsusi feodal torpaq mülkiyyətininsə iki forması vardı: dəstgird, xvastaq. Vergi və mükəlləfiyyətlərin ən mühümü qazidağ, xaraq və xarq idi.

Albaniyada zərdüştilik geniş yayılmış, habelə xristianlıq da vüsət tapmışdı.[13]

[12] Yenə orada, səh.55-56.
[13] Azərbaycan tarixi, ll cild, səh.84-108.



Ərəb işğalı dövründəsə Azərbaycan ərazisini məlik idarə edir, xəzinə qulluqçuları «amil», hərbi başçılar «əmir», hakimlər «qazi» adlanırdılar. Torpaq siyasəti xəlifə torpaqları, habelə iqta, mülk, vəqf və icma torpaqları kimi təşəkkül tapmışdı və Azərbaycan əhalisi islam dinini qəbul etmişdi.[14]

IX-X əsrlərdə yaranan feodal dövlət qurumlarının hakimiyyətləri dövründə Azərbaycanın müxtəlif yerlərində Sacilər, Şirvanşahlar, Dərbənd Haşimi əmirliyi, Sünik və Arsax-Xaçın knyazlıqları, Şəki məlikliyi, Salarilər, Rəvvadilər dövlətləri ayrı-ayrılıqda fəaliyyət göstərirdilər və bu dövlətlərin başçılarının əksəriyyəti azərbaycanlılaşmış ərəb feodalları idilər. Onların dövlət quruluşları azacıq fərqlə, demək olar ki, Vll-Vlll əsrlərdə mövcud olmuş quruluşun təzahürü idi.[15]

İnkişaf etmiş feodalizm dövründə isə Azərbaycanda «Atabəylər dövləti» yarandı, ölkə səlcuq sultanları, valilər, hərbi başçılar və əmirlər arasında paylandı, «vəliəhd» elan edilən şəhzadənin tərbiyəçisi mənasını daşıyan «atabəy» ləqəbi hökmdarın ali tituluna çevrildi. Atabəy əmirlərin, iqtadarların, valilərin süzereni idi və feodal iyerarxiyasında yüksək pillə tutur, formal olaraq səlcuq sultanından sonra ikinci şəxs hesab edilirdi.

Vəzir divanxana işçilərinin (əshab əd-divan) başçısı kimi fəaliyyətdə idi. Dövlət əhəmiyyətli üçüncü vəzifə «hacib» (hökmdarın şəxsi xadimi) sayılırdı. Maliyyə idarələrinə başçılıq «mustovfiəl - məmalik» («məmləkətlər mutovfisi») adlanan maliyyə məmuru tərəfindən icra edilirdi. Vali öz vilayətinin dünyəvi hakimi idi, dini hakimlər olan qazilərsə ona qeyd-şərtsiz itaət edirdilər. Vəzir validən sonra dövlətdə ikinci şəxs funksiyasını daşıyırdı.[16]

Xlll-XlV əsrləri isə Azərbaycanda monqol əsarətinin başlanması, ölkədə Hülakular, Çobanilər, Cəlairilər dövlətlərinin yaranması, habelə Şirvanşahlar dövlətinin və

[14] Yenə orada, səh.182-192.
[15] Yenə orada, səh.283-349.
[16] Azərbaycan tarixi, ll cild, səh.370-373.

Arsax-Xaçın knyazlığının öz fəaliyyətlərini davam etdirməsi ilə səciyyələndirməliyik. Qeyd olunmalıdır ki, monqollar Azərbaycana qərarlaşmış idarə sistemi ilə gəlmişdilər. Hülakular dövlətində ölkənin ali orqanı «qurultay» hesab olunurdu. Dövlətin başçısı «elxan», yaxud «sultan» adlanırdı. Ali idarə sistemində ikinci yeri «naib əs-səltənət» («səltənətin naibi») tuturdu, üçüncü yer isə baş əmirə, yaxud başqa sözlə desək "Əmirül-ümərа"ya, yəni "Əmirlər əmiri"nə xas idi. İnaq, bukavul, təvaçi, yasovul, bəlarquçi, bəxşi və s. kimi vəzifələrin daşıyıcıları ali hərbi məmurlar sayılırdılar.

Qoşun təşkilatında aşağıdakı bölgü mövcud idi: tümənlər, minliklər, yüzlüklər, onluqlar. Mərkəzi dövlət aparatında iyirmidən artıq divan mövcud idi. Mərkəzi divanlar vəzirlər vasitəsilə idarə olunurdu. Baş mustovfi dövlət gəlirlərini müəyyənləşdirir, onların toplanması və xərclənməsi üzrə ümumi mühasibat işləri aparırdı. Ölkənin əmlak rəisi «uluq bitikçi» idi. Münşi əl-məmalik dövlət sənədlərinin tərtibi ilə məşqul olur və xarici dövlətlərlə əlaqələri təmzimləyirdi. Dövlət xəzinələri nazir, müşrif və xazen tərəfindən idarə olunurdu. Dövlətin təhlükəsizliyini isfəhsalar təmin edir, məhkəmə proseslərinə dövlət arbitrajları (hekəm əl-məmalik) nəzarət edirdilər.

Sarayda bir neçə divan fəaliyyət göstərirdi: Bayerat divanı istifadəsiz qalmış torpaqların qeydə alınması və istifadə olunması, imarət divanı tikinti işləri, məsas divanı sənətkarlıq işləri ilə məşqul olurdu.

Dövlətin ərazisi vilayətlərə, onlar isə öz növbələrində tümənlərə bölünmüşdü. Vilayətləri hakimlər idarə edir, şəhərlərə hakim, hərbi canişin, vəzir, qazi, mustovfi, bititkçi, nazir, müşrif, isfəhsalar, mütəsərrif, şəhnə, qələmi, müqənnən, müəddil, mühəssil kimi vəzifəli şəxslər nəzarət edirdilər.

Vilayətlərdəki dövlət torpağlarının idarəsi müqatiə (icarə) sahiblərinə tapşırılırdı.

Dövlətin mərkəzi dini təşkilatında vəqf divanı mövcud idi. Vəqflər iki yerə bölünürdü: dövlət vəqfləri və seyid vəqfləri.



Torpaq mülkiyyəti formaları təkcə Azərbaycanda deyil, eləcə də Yaxın və Orta Şərqin başqa ölkələrində əvvəllər də bərqərar olan divani (dövlət torpaqları), xass, yaxud xassə, (xüsusi torpaqlar), incu (hakim sülaləyə mənsub torpaqlar), mülk, vəqf, iqta və cəmaətidən (icma) ibarət idi.

Dövlətin əsas vergiləri sırasına xərac, bac, qopçur, təmğa, ixracat, əvariz, bağbaşı və s. daxil idi.[17]

Qeyd etmək lazımdır ki, biz XV əsrədək Azərbaycanda dövlət quruluşu məsələsi ilə əlaqədar məlumatları əsasən İ.Əliyev, S.Qaşqay və V.Piriyevin əsərlərindən əxs etmişik. Bu monoqrafiyanın hədəfi olan əsas mövzumuzun yazılışına başlamazdan əvvəl biz, Azərbaycanın qədim və orta əsrlər tarixində mövcud olmuş dövlətlərimizin quruluşuna müxtəsər nəzər saldıq ki, zənnimizcə, mövzudan yayınma kimi qəbul edilməməlidir.

Heç şübhəsiz ki, XV əsr də əvvəlki yüzilliklər kimi dövlətçiliyimizdə mühüm rol oynamışdır. Belə ki, bu əsrdə ölkəmizin ərazisində Qaraqoyunlu (1410-1467) və Ağqoyunlu (1468-1501) kimi feodal dövlətlər yaranmış və fəaliyyətdə olmuş, Şirvanşahlar dövləti isə (VI-XVI əsrlər) öz siyasi durum və fəaliyyətini davam etdirmişdir.

Qeyd olunmalıdır ki, XV əsrdə Azərbaycanda dövlət quruluşuna xüsusi həsr edilən kitab və dissertasiya yoxdur. Bu sahədə yalnız bəzi «Azərbaycan tarixi» kitablarının müvafiq fəsillərində,[18] həmçinin bir-iki monoqrafiyada[19] müəyyən məlumata təsadüf olunur. Prof. S.M.Onullahinin xüsusi

---

[17] Azərbaycan tarixi, III cild, «Elm» nəşriyyatı, Bakı, 1999, səh.47-60.

[18] Azərbaycan tarixi (ən qədim dövrlərdən XX əsrin əvvəllərinə qədər) Bakı, «Elm» nəşriyyatı, 1993, səh.155,158; Azərbaycan tarixi, (uzaq keçmişdən 1870-ci illərə qədər), «Azərbaycan» nəşriyyatı, Bakı,1996, səh.326-327; o cümlədən yuxarıda istifadə etdiyimiz «Azərbaycan tarixi»kitabının müvafiq fəsil və yarımfəsilləri.

[19] C.İbrahimov. Qaraqoyunlu dövləti, Bakı,1948, səh.69-70; Yenə onun: Феодальные государства на территории Азербайджана XV века, Bakı,1962, səh.76-78; Şahin Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, Bakı, 1983, səh.42-73, Y.Mahmudlu. Azərbaycan diplomatiyası, Bakı,1996, səh.90.

məqəlləsi vardırsa da,[20] təbii ki, kiçik bir məqalə çərçivəsində bir əsr müddətində Azərbaycan ərazisində fəaliyyət göstərən üç dövlətin siyasi və iqtisadi quruluşunun bütün tarixi və hüquqi cəhətləri barədə ətraflı məlumat vermək mümkün deyildir. Şirvanın dövlət üsul-idarəsi haqqında isə M.X.Nemətovanın bir məqaləsində müəyyən məlumat vardır.[21] Rus tədqiqatçısı İ.P.Petruşevskinin böyük həcmli məqaləsində də bu mövzuya dair (başqa tarixi məsələlərlə yanaşı) məlumat əks etdirilmişdir.[22] Amerika alimi C.Vudsun «Ağqoyunlular: tayfa, konfederasiya, imperiya» kitabında da Ağqoyunlularda dövlət quruluşuna dair bir sıra xarakterik səhifələr yox deyildir.[23]

XV əsrdə Azərbaycan feodal dövlətlərində mövcud olmuş siyasi quruluş, mərkəzi və yerli idarəetmə orqanları, hərbi sistem və məhkəmə quruluşu, əmlakın hüquqi vəziyyəti, torpaq üzərində mülkiyyət formaları, vergi və mükəlləfiyyətlər, habelə hüququn inkişafında əsas cəhətləri öyrənmək məqsədi ilə biz, təbii ki, yuxarıda adları çəkilən əsərlərdən başqa mənbəşünaslıq, tarixşünaslıq və hüquqşünaslıq baxımından dəyərli olan bir sıra elmi monoqrafiya və məqalədən də istifadə etdik. Bir çox Azərbaycan və xarici ölkə müəllifinin əsərlərində əsasən siyasi vəziyyətin əks etdirilməsinə baxmayaraq, ara-sıra sosial, iqtisadi, hüquqi, mədəni və ideoloji məsələlərə də diqqət yetirilmişdir ki, biz onlara müraciət etməklə qarşımıza qoyduğumuz məsələnin tədqiqini dolğunluqla araşdırmağa cəhd etdik. Azərbaycan alimlərindən A.K.Rzayevin, Q.M.Kərimovun, E.Cəlilovun, O.Ə.Əfəndiyevin, S.Aşurbəylinin, Y.Mahmudlunun,

[20] S.M.Onullahi XV əsrdə Azərbaycan dövlət quruluşunun bəzi məsələlərinə dair, Az.SSR EA-nın «Xəbərlər»i, Tarix, Fəlsəfə və Hüquq seriyası №4, 1966, səh.35-45.

[21] Yenə həmin jurnal, səh.63-71.

[22] Сборник статей по истории Азербайджана, выпуск 1, Баку,1949, стр.144-152.

[23] C.Vuds. Ağqoyunlular: tayfa, konfederasiya, imperiya. Türk dilinə çevirən Sibel Özbudun, İstambul,1993, səh.83-96.



Ş.Məmmədovanın və Ş.Mustafayevin kitablarının[24] da mövzunun tədqiqində böyük əhəmiyyəti olmuşdur. Biz həmçinin «İslam ensiklopediyası»nın materiallarından, xüsusilə bu yaxınlarda «Elm» nəşriyyatı tərəfindən çap olunan XV əsr müəllifi Əbubəkr Tehraninin (o, Uzun Həsən Ağqoüunlunun tarixçisi olmuşdur) «Kitabi-Diyarbə' қriyyə» əsərindən[25] faydalanmışıq.

Göstərilən dövrdə Azərbaycanın ümumi vəziyyətinə müxtəsər nəzər salsaq müəyyən etmək olur ki, ölkədə o zaman iki böyük dövlət (biri digərini əvəz etməklə) – Qaraqoyunlu və Ağqoyunlu yaranmış və süquta uğramış, Şirvanşahlar isə öz dövlət müstəqilliyini qoruyub saxlamağa cəhd etmiş və buna nail olmuşdular.

XlV yüzilliyin ortalarında Türkiyənin şərq hissələrində siyasi səhnəyə çıxan Qaraqoyunlu və Ağqoyunlu tayfaları tezliklə öz bəyliklərini təşkil etmiş, XV əsrdə isə dövlət yaratmağa müvəffəq olmuşlar. Bizim tərəfimizdən Azərbaycanın XV əsrdə mövcud olmuş siyasi quruluşu, idarə sistemi, torpaq mülkiyyəti formaları, hərbi quvvələri və s. barədə danışılmazdan əvvəl qeyd etməliyik ki, o zaman Azərbaycanın cənub vilayətləri Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin metropoliyası, yəni mərkəzi ərazisi idi. Hər iki dövlətin paytaxtı («darus-səltənə») Təbriz şəhəri olmuş, Azərbaycan müstəqil olaraq padşah tərəfindən idarə olunmuş, onun ayrı-ayrı vilayətləri isə (Kürdüstan, İraqi-Ərəb, İraqi-Əcəm və s.) sülalə üzvlərinin və ya onların canişinlərinin

[24] А.К.Рзаев. Очерки истории политико-правовых учений Азербайджана, Bakı,1983; Q.Kərimov. Şəriət və onun sosial mahiyyəti, Bakı,1987; E.Cəlilov. Müsəlman hüququ, Bakı,1995; Yenə onun: Azərbaycan dövlət hüquq tarixi, Bakı, 1996, O.Ə.Əfəndiyev. Azərbaycan Səfəvilər dövlət, Bakı, 1993; С.Б.Ашурбейли. Государство Ширваншахов, Bakı,1983; Ş.Məmmədova. Qazi Əhməd Quminin «Xülasət ət-təvarix» əsəri Azərbaycan tarixinin mənbəyi kimi, Bakı,1991; Ш.Мустафаев Восточная Анатолия: от Ак-коюнлу к Османской империи, Москва,1994.

[25] Əbubəkr Tehrani. Kitabi-Diyarbəkriyyə, Fars dilindən çevirən R.Şükurova, Bakı,1998.

hakimiyyətləri altında idarə hakimiyyətinə məruz qalmışlar.[26] Məlum olduğu kimi Ağqoyunlu və Qaraqoyunlu dövlətləri Xorasan dövləti istisna olmaqla bütün İranda, həmçinin Qarabağda (Gəncə və Şəmkir də daxil olmaqla Kür çayına qədər) hakimiyyətdə biri digərini əvəz etmişdi. Kür çayının şimalında Dərbənd də daxil olmaqla XV əsr boyu Şirvanşahların Dərbəndi sülaləsi öz hökmranlığını davam etdirmişdi. Bu dövlətlərin bir-birinin munasibətlərinə qısa nəzər saldıqda belə qənaətə gəlmək olur ki, Arazın cənubda yerləşən hər iki Azərbaycan dövləti ilə Şirvanşahlar dövləti arasındakı münasibət ümumiyyətlə normal mahiyyət daşımış, hətta Ağqoyunlularla Şirvanşahlar arasında qohumluq əlaqələri də olmuşdur. Məsələn, Baysunqur Ağqoyunlunun arvadı Şirvanşah Fərrux Yəsarın qızı idi. XV əsr Azərbaycan dövlətlərinin əsasını təşkil edən Ağqoyunlu və Qaraqoyunlu tayfa-başçılarının münasibətlərinə gəldikdə isə qeyd olunmalıdır ki, onların arasında XIV əsrin sonlarından XV yüzilliyin sonunadək nifaq və düşmənçilik davam etmiş, tayfa əmir və padşahları biri digərinin rəqibi olmuşlar. Məsələn, 1447-ci ildə Ağqoyunlu bəyi Uzun Həsən Ağqoyunlu qardaşı Cahangir Mirzənin yanına adam yollayıb ona bu məsləhəti çatdırır: «Biz atabir, anabir iki qardaşıq. Vəzifəmiz budur ki, bir-birimizlə əhd bağlayıb and içək ki, bundan sonra qardaşlıq və səmimiyyət yolu ilə gedib ədavət və düşmənçilikdən çəkinəcəyik. Bizimlə Qaraqoyunlular arasında köhnə ədavət olduğu üçün ona (Cahanşah Qaraqoyunluya – Ş.F.) qoşulmaq yaramaz».[27]

Lakin, bu iki sülalə əmirləri arasındakı düşmənçiliyin aşağı təbəqədən olan Qaraqoyunlu və Ağqoyunlu əhalisinin əlaqə və münasibətlərinə həlledici təsiri olmurdu, onlar bir-birləri ilə daim açıq, yaxud gizli təmasda idilər. Məsələn, Uzun Həsən anası Saray xatun Ağqoyunluya deyir: «Ağqoyunlu və Qaraqoyunlu nökərləri (burada: əskər və hərbi

[26] Azərbaycan tarixi, III cild, «Elm» nəşriyyatı, Bakı,1999, səh.104-105.

[27] Kitabi-Diyarbəkriyyə, səh.137.



xidmətçiləri – Ş.F.) bir-birlərinə gəlib-gedirlər, onların münasibətləri həmişə belə olub. Lakin bizim xanədanın böyük əmirləri Qaraqoyunluların yanına getməyiblər. Mənim qardaşım Cahangir Mirzənin Cahanşah bəyə qoşulması düzgün və məqsədəuyğun deyil».[28]

Əvvəlki əsrlərdə olduğu kimi XV yüzillikdə də əhalini tabe vəziyyətdə saxlamaq üçün hakim sinif, təbii ki, feodal əyanların mənafelərini müdafiə edirdi. Feodallar geniş ərazilərə və təmtaraqlı dövlət aparatına malik idilər. İstər Qaraqoyunlu hökmdarı Cahanşah (hakimiyyət illəri: 1435-1467), istərsə də Ağqoyunlu padşahları Uzun Həsən (hakimiyyət illəri: 1453-1478) və Əhməd Ağqoyunlu (hakimiyyət ili: 1497) mərkəzləşmiş dövlət yaratmağa səy göstərmişlərsə də, lakin müstəqilliyə can atan və siyasi-hüquqi səlahiyyətləri əllərində saxlamağa çalışan yerli feodallar və hərbi-köçəri əyanlar hər vasitə ilə bu işə maneçilik törətmişlər. Bundan əlavə, ölkənin iqtisadi və siyasi dağınıqlığı, feodallar arası çəkişmələr XV əsr boyu bütün Azərbaycanın mərkəzi bir hakimiyyət altında idarə edilməsinə mane olurdu. Digər tərəfdən ayrı-ayrı əmirlər möhkəm nufuza malik idilər, onlar dövlət işlərinə nəzarət edir, bəzən hətta hökmdara qarşı çıxırdılar. Hətta bəzi yüksək rütbəli əmir və tayfa başçılarının məşvərəti əsasında bu və ya digər bir şəxs Qaraqoyunlu və Ağqoyunlu sülalə hakimlərini əvəz edirdi. Hərbi-köçəri əyanlar arasında tez-tez toqquşmalar baş verirdi. Vergi və mükəlləfiyyətlərin sayı çox idi.

Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərindəki saray, divan və qoşun təşkilatı, habelə ayrı-ayrı əyalət və şəhərlərin idari quruluşu XIII-XIV əsrlərdə Azərbaycanda mövcud olmuş Elxani və Cəlairi dövlətlərinin quruluşunun tam eyni olmasa da, onun inkişaf etmiş forması idi. Bu ənənəvi

[28] Yenə orada, səh.138.

dövlət quruluşu hətta Səfəvilər hakimiyyətinin ilk mərhələsində də dəyişilməz qalmışdı.[29]

Beləliklə, bu qənaətə gəlmək olar ki, XV əsr Azərbaycan feodal dövlətləri məzmun və mahiyyət etibarilə təxminən eyni quruluşa malik olmuşlar və qarşıda duran əsas məsələ bu dövlətlərin müxtəlif siyasi, sosial və hüquqi cəhətlərini tədqiq etməkdir.

XV əsrin hüquqi aktları içərisində Uzun Həsənin qanunları mühüm yer tutur ki, onlar təkcə Azərbaycanda deyil (1470-1477-ci illər), habelə Ağqoyunlulara tabe olan ölkələrdə də tətbiq edilirdi. Təəsüf ki, həmin qanunlar barədə dolğun məlumat yoxdur. Gələcəkdə Uzun Həsən və digər Ağqoyunlu şahlarının hüquqa dair qanunları imkan daxilində əldə edilməli və elmi şəkildə öyrənilməlidir.

Beləliklə, bir daha söyləmək olar ki, bu dərs vəsaitinin "Giriş"ində nəzərə çatdırılan tarixi Azərbaycan dövlətlərinin təşəkkül tapmaları və süquta uğramaları prosesi hələ gələcəkdə də öyrənilməli, məzkür movzu yeni-yeni məxəz, mənbə və məlumatların cəlb olunması ilə daha dərindən tədqiq olunmalıdır.

[29] Bu haqda geniş məlumat üçün bax: И.П.Петрушевский. Государства Азербайджана в XV веке. Сборник статей по истории Азербайджана, Бакы,1949, səh.197; S.M.Onullahi. XV əsrdə Azərbaycanda dövlət quruluşunun bəzi məsələlərinə dair, Az. SSR EA «Xəbərlər»i, №4, 1966, səh.35-47; M.X.Nemətova. Şirvan tarixinə dair qiymətli sənəd. Yenə həmin jurnal, səh.63-72; Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, Bakı,1983, səh.42-87; Ş.Fərzəlibəyli. Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə, Bakı,1995, səh.3-5; A.K.Rzayev. Göst. əsəri, səh.86; Q.Kərimov. Göst. əsəri, səh.5-6; Y.Mahmudlu. Azərbaycan diplomatiyası, səh.90.



# I FƏSİL:

## QARAQOYUNLU, AĞQOYUNLU VƏ ŞİRVANŞAHLAR DÖVLƏTLƏRİNİN SİYASİ QURULUŞU

Bu və sonrakı fəsillərin müəyyən qədər ətraflı öyrənilməsi və müqayisəli araşdırılması xüsusunda bir neçə kəlmə söz deməyi məqsədə uyğun sayıram. Tarixin müxtəlif mərhələlərində, o cümlədən orta əsrlərdə, xüsusilə XV əsr dövründə mövcud olan Yaxın və Orta Şərq, həmçinin Kiçik və Mərkəzi Asiya feodal dövlətləri quruluş etibarilə biri-digərinə yaxın olduqlarından biz yeri gəldikcə XIV əsrin sonu - XV əsrin əvvəli üçün ən dəyərli mənbələrdən olan görkəmli dövlət xadimi Əmir Teymurun oxuculara "Tüzuki-Teymuri", "Tüzukati-Teymuri", "Məlfuzati-Teymuri" və "Vaqiati-Teymuri" kimi müxtəlif adlarla təqdim olunmuş əsərinin müvafiq məlumatlarını da təqdim edəcəyik.

Göstərilən yüzillikdə Azərbaycan özünün inkişaf etmiş feodalizm mərhələsini davam etdirirdi və onun cənub və şimal ərazilərində Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar kimi dövlətlər mövcud idilər. Qədim dövrlərdə olduğu kimi, orta əsrlərin bu bir əsrlik mərhələsində də Azərbaycan Yaxın və Orta Şərq xalqları tarixində böyük rol oynamışdır. Bu əsr Azərbaycan ərazisində iki böyük dövlətin yaranması ilə xarakterizə olunur, Şirvan isə artıq 8 əsrdən çox idi ki, Şirvanşahlar tərəfindən idarə edilir və müstəqil siyasət yeridirdi. Dərbəndi-Şirvanşahların uğurla həyata keçirdikləri daxili və xarici siyasət nəticəsində Şirvanda qonşu Azərbaycan dövlətlərindən fərqli olaraq sülalədaxili mübarizələr yox idi.[30] Lakin XV əsr Azərbaycan feodal dovlətləri məzmun və mahiyyət etibarilə bir olmuşlarsa da, formaca bəzi sahələrdə müəyyən fərqlər var idi, yəni cənubda Qaraqoyunlu və Ağqoyunlu dövlətləri ilə şimaldakı Şirvanşahlar və Şəki hakimlərinin dövlət quruluşları arasında

[30] İ.P.Petruşevski. Göst.məqalələr toplusu, səh.183; C.İbrahimov. Azərbaycan ərazisində ...,səh.54-55.

müxtəliflik nəzəri cəlb edən xüsusiyyətlərdəndir. Şirvan və Şəkinin dövlət aparatlarında· oturaq feodal əyanlar böyük nufuza malik idilərsə, Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində köçəri və yarımköçəri tayfalardan olan hərbiçi əyanlar mühüm rol oynayırdılar.[31] Lakin bu o demək deyildir ki, Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində oturaq əhali arasından çıxmış feodal əyanların və yüksək müsəlman ruhanilərinin rolu olmamışdır.

Qaraqoyunlu və Ağqoyunlu dövlətləri hərbi-inzibati əyalətlərə bölünürdü. Azərbaycan Qaraqoyunlu və Ağqoyunlu padşahları tərəfindən idarə olunurdu, əyalətlər isə həmin padşahların təyin etdikləri hakim sinfin üzvləri, yaxud məşhur tayfa başçılarının (canişinlərin) nəzarəti və idarəsi altında idi. Qeyd olunmalıdır ki, canişinlər əsasən hərbi işləri idarə edir, mülki inzibati orqanların işlərinə isə oturaq feodal əyanlar rəhbərlik edirdilər. Əyalət canişinlərinin də padşah kimi öz sarayı, inzibati aparatı, büdcəsi və silahlı dəstələri vardı.[32]

Hakimiyyətin ali orqanı qurultay, yəni hərbiçi feodal əyanlar tərəfindən keçirilən böyük məclis idi. Qurultayda ölkənin daxili və xarici siyasət məsələləri müzakirə olunur, dövlətin fövqəladə hərbi işləri haqqında qərar qəbul edilirdi. Amma, qurultay hakimiyyətin daim fəaliyyət göstərən, qanun və qərarlar çıxaran orqanı deyildi və onun rəyi padşah üçün mütləq hesab olunmurdu.[33] Dövlətin müharibə, sülh, taxta varislik və s. kimi mühüm siyasi məsələlərini sülalə üzvləri və əmirlərin kənqaş adlanan qapalı müşavirəsi həll edirdi.[34]

Azərbaycan, İran, Mərkəzi Asiya, Kiçik Asiya, eləcə də Yaxın və Orta Şərq ölkələrində mövcud olmuş feodal dövlətlərinin idarəçilik forması mütləq monarxiya olmuşdur. Deməli, hər bir hökmdar mütləq monarx idi və o öz dövlətini müvafiq idarəetmə orqanları vasitəsilə özü bildiyi kimi idarə edirdi. Feodal dövlət başçılarının hər biri özünün hakimiyyəti

[31] Azərbaycan tarixi, I cild, Bakı,1961, səh.23.
[32] İ.P.Petruşevski. Göst.məq.toplusu, səh.198; C.İbrahimov, Azərbaycan ərazisində ...,səh.78
[33] C.İbrahimov Azərbaycan ərazisində ...,səh.78.
[34] Azərbaycan tarixi, «Elm», III cild, səh.105.



altındakı dövləti islam dini, möhkəm qayda-qanun və nizam-intizam əsasında qoruyub saxlamağa çalışırdı. Əmir Teymur yazırdı: "Başım çəkənlərdən onu da görüb öyrəndim ki, əgər dövlət din və ayin əsasında qurulmazsa, qanun-qaydaya tabe olmazsa bu səltənətin təntənəsi, qüdrəti, dözümü yox olacaqdır və belə səltənət çılpaq adama oxşayar - onu görənlər gözlərini yumarlar... Buna görə də mən öz səltənətimi islam dini, qanun və nizam əsasında qurdum" (Bax: "Əmir Teymurun vəsiyyətləri" kitabi, Bakı, 1991, səh. 50)

### *I. Mərkəzi və yerli idarəetmə orqanları (dövlət başçıları, idarəetmə orqanlarının təsnifatı)*

Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin hər üçünün quruluşu XIII-XIV əsrlərdə Azərbaycandakı Elxani və Cəlairi feodal dövlətlərinin quruluşundan əxz və tətbiq olunmuşdu. XV əsrin əvvəllərində Əmir Teymurun (hakimiyyət illəri: 1370-1405) həmləsindən qaçıb bir müddət Osmanlı imperiyasında yaşamaq məcburiyyətində qalan Qara Yusif Qaraqoyunlu bir neçə ildən sonra özünün başçılıq edəcəyi dövlətdə, həmçinin Osmanlı dövlət quruluşunun bəzi cəhətlərini də bərqərar etmişdi. 1410-cu il avqustun 30-da Təbriz yaxınlığında öz keçmiş müttəfiqi və yaxın qohumu olan Sultan Əhməd Cəlairini (hakimiyyət illəri: 1382-1410) məğlubiyyətə uğradan Qara Yusif bu Cəlairi hökmdarına hakimiyyətin yeni sülaləyə – Qaraqoyunlulara keçdiyini hüquqi cəhətdən qanuniləşdirən sənədlərə qol çəkdirmişdi. Çünki bu Qaraqoyunlu əmirinin hüquqi cəhətdən padşah olmaq səlahiyyəti yox idi. Dövrün qanunlarına görə şahlıq irsi xarakter daşıyırdı və hökmdar yalnız özündən əvvəlki hökmdarın varisi ola bilərdi. Qara Yusifin atası Qara Məhəmməd (hakimiyyət illəri: 1380-1389) isə fəqət Cəlairilərə xidmət edən bir əmir olmuşdu. Gələcək hadisələrin cərəyanını sanki irəlilədən görən Qara Yusif hələ Dəməşq şəhərində həbsdə olduqları zaman azyaşlı oğlu Pirbudağı Sultan Əhməd Cəlairiyə rəsmi sənədlə oğulluğa

vermiş, bu Cəlairi hökmdarının qətlindən bir il sonra (1411) Pirbudağın adına yazılmış yarlıq (rəsmi şah sənədi) əsasında Təbrizdə çağırılan Azərbaycan əyanları və Qaraqoyunlu əmirlərinin məclisində Pirbudağı «sultan» elan etmişdi.[35]

Qara Yusif daxil olduğu siyasi dairədə quvvədə olan huquqi ənənəyə riayət etmək məcburiyyətində idi. Müstəqil hökmdara verilə «sultan» titu lunu XlV əsrdə yalnız hülaku ailəsi, yaxud onunla qohum xanədana mənsub olan şəxslər daşıya bilərdi. Buna görə də Qara Yusif heç də təsadüfi deyil ki, özünü deyil, Sultan Əhməd Cəlairinin qanuni xələfi və varisi hesab edilən Pirbudağı şahlıq taxtına çıxardı. Taxta cülus mərasimindən sonra verilmiş fərman və hökmlərin başında sabiq türk-monqol ibarəsi ilə «Sultan Pirbudaq xan yarlığından ! Əbunəsr Qara Yusif Bahadur ! Sözümüz !» ifadəsi yazılmışdır.[36] Amma, təbii ki, Pirbudağın sultan adlanmasına baxmayaraq, bütün dövlət işləri Qara Yusifin əlində idi.

Beləliklə, qeyd etmək lazımdır ki, Qaraqoyunlu, Ağqoyunlu və Şirvan hökmdarlarının adlarının əvvəlinə «sultan», sonuna isə «padşah, bahadur, xan» titulları artırılır, onların ölkə başçısı olması həmin titullarla öz hüquqi səlahiyyətlərini alırdı.[37] Cığatay padşahlarının adlarının əvvəlinə artırılan yüksək «əmir» titulu isə əgər Mavərənnəhr ölkələrində müstəqim surətdə hökmdar mənasını ifadə edirdisə (məsələn məşhur özbək hökmdarı Əmir Teymur), Qaoraqoyunlu, Ağqoyunlu və Şirvanşahlarda eyni zamanda ordu başçısı, hərbi sərkərdə anlamını da özündə əks etdirirdi. «Kitabi Diyarbəkriyyə»də də Qaraqoyunlu dövlətinin hökmdarı, olmazdan əvvəl və sonra Qara Yusifin müəllif tərəfindən həmişə «əmir» titulu ilə verilməsinin səbəbi bu hökmdarın Ağqoyunlu Uzun Həsəndən aşağı səviyyədə tutulmasıdır. Məsələn, «Əmir Yusif Əmir Osmana xəbər

---

[35] Faruk Sümer. Qaraqoyunlular, l cild, Ankara,1967, səh.70; Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə ..., səh.91.

[36] Faruk Sümer. Göst.əsər, səh.88.

[37] İslam Ensiklopediyası, l cild, İstambul,1965.s.59. İslam Ensiklopediyası, lll cild, İstambul,1988, səh.305.



göndərir ki...»,[38] yaxud «Sultan Muradla Əmir Qara Yusif arasında dostluq olduğu üçün...».[39] Rəsmi sənədlər, fərmanlar və zərb edilən sikkələrin üstündəki yazılardan da məlum olur ki, Qaraqoyunlu və Ağqoyunlu hökmdarları adətən «sultan» və ya «padşah» titulu daşımışlar.[40] Həsən bəy Rumlu və başqa orta əsr tarixçiləri Şirvanşahları da «padşah , vali, hakim, sultan» titulları ilə adlandırmışlar.[41] Kitabələr də Şirvanşah l İbrahimin «sultan» hətta «sultanül-əzəm» («əzəmətli sultan») titulu daşıdığını əks etdirir.[42]

Ə.Tehraninin Şirvan sultanları barədə söylədiyi fikir diqqəti cəlb etməyə bilmir: «Onların (Şirvan sultanlarının – Ş.F.) qədimdən Şirvan səltənətinə sahib olması və Ənuşirəvan nəslinə mənsub olmaları hamıya məlumdur və indiyədək heç bir padşah onları öz mülklərindən çıxarmayıb.[43] Şirvanın bəzi hökmdarları isə «Şiranşah» («şirlər şahı») tituluna layiq görülmüşlər. Məsələn, Fərrux Yəsarın sikkələrində bu titula təsadüf olunur.[44]

__Şah:__ O, Azərbaycan feodal dövlətlərinə ümumi rəhbərlik edir, səltənətdəki torpaq və suyun baş mülkiyyətçisi sayılırdı. Şah ölkənin ən böyük feodalı idi.[45] O, hakimiyəti altındakı yerləri yuxarı təbəqədən olan əyanlar vasitəsilə idarə edir, məmləkətin yeganə varisi sayılırdı. Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin hökmdarları əsasən «padşah» titulu daşımışlar. Uzun Həsən özünün Osmanlı və Teymuri sultanları səviyyəsində hökmdar olduğunu nəzərə çatdırmaq məqsədilə «sultan», «əmir», və «sahibqran» titullarını da qəbul etmişdi.

---

[38] Kitabi-Diyarbəkriyyə, səh.59.

[39] Yenə orada, səh.85.

[40] S.Onullahi. Göst.məq. səh.37.

[41] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə, səh.42

[42] M.Nemətova. Şirvanın XlV-XVl əsrlər tarixinin öyrənilməsinə dair, Bakı,1959, səh.12,131.

[43] Kitabi-Diyarbəyriyyə, səh.200.

[44] M.Neymətova. Şirvanın...,səh.89.

[45] О.Эфендиев.Образование Азербайджанского государства Сефевидов в начале XVI века, Bakı,1961, səh.127.

Azərbaycanda Ərəb hakimiyyətindən başlamış ta XIX əsrə qədər bütün böyük və kiçik feodal dövlətlərində divan institutu fəaliyyətdə olmuşdur. Bu institut özünün mövcudluğu dövründə (VII-XVIII əsrlər) aşağıdakı inkişaf mərhələləri keçmişdir:

1. Ərəb istilalarının ilk dövründə Xəlifə Ömərdən (634-644) başlayaraq dövlət gəlirinin qeydə alındığı, siyahıların saxlandığı yer; 2. Əməvilər və Abbasilər dövründə vergi və maliyyə işləri ilə məşğul olan dövlət idarəsi; 3. Osmanlı imperiyasında böyük vəzirdən, müftidən və vəkillərdən ibarət dövlət şurası; 4. Dunay Knyazlıqları Moldova və Volaxiyada dövlət şurası, ali məsləhətçi və icraçı orqan Rumıniya yarananadək (1859) Buxarestdə, Krayevoda və Yassıda məhkəmə orqanları da divan adlanırdı.

Divan idarə sistemi orta əsrlərdən Azərbaycanda da mövcud olmuşdur. Səlcuqilər, Eldəgəzlər, Elxanilər, Cəlairilər, Şirvanşahlar, Qaraqoyunlular, Ağqoyunlular, Səfəvilər dövründə dövlətin və təsərrüfatın bu və ya digər sahəsinin idarəsini özündə cəmləşdirən müxtəlif divanlar mövcud idi. Azərbaycan alimi Məhəmməd ibn Hinduşah Naxçıvaninin "Dəstürəl - katib fi təyinəl - məratib" («Dərəcələrin təyin edilməsində katiblər üçün təlimnamə») əsərində 20-ə yaxın divan adı çəkilir. Ümumi idarə işləri sahibdivanın başçılıq etdiyi "ali divan" tərəfindən aparılırdı. Hər bir vilayətin öz divanı vardı ki, bütün vilayət divanı mərkəzi divana tabe idi. Xanlıqlar dövründə daxili və xarici siyasətlə məşğul olan divanlara divanbəyi başçılıq edirdi. (Bax: Azərbaycan Sovet Ensiklopediyası, III c., Bakı, 1979, səh. 402-440).

Əlbəttə, divanın ali rəhbəri hökmdarın özü idi. Teymuri sarayında müxtəlif dövlət işlərinin icrası üçün divan çağırılanda, yaxud ziyafətlər veriləndə, ya da diplomatik görüşlər keçiriləndə xüsusi qayda-qanunla hərəkət edilməli, Teymur tərəfindən müəyyən olunan məsələlər cüzi də olsa dəyişikliyə uğramadan yerinə yetirilməli idi. Hökmdar özü səltənət taxtında oturur, oğulları, nəvələri, qohum-qardaşları, "ayın haləsi kimi" taxtı dövrəyə alıb əyləşirdilər. Taxtın sağ



tərəfində qərar tutmaq seyidlərə, qazilərə, üləmalara, fazillərə, şeyxlərə, ululara və başqa "şərəfli adamlara" məxsus idi. Sol tərəf hərbiçilərə, o cümlədən əmirül-üməraya, bəylərbəyiyə, noyonlara, ulus başçılarına tümən və qoşun əmirlərinə, minbaşılara, yüzbaşılara, onbaşılara xas idi. Divanbəyi və vəzirlər taxtın qarşısında əyləşirdilər. Hakimlər (vilayət hakimləri), yurd ağsaqqalları və "hər elin ağıllı, etibarlı kişiləri" isə vəzirlərin arxa tərəfində əyləşirdilər. "Bahadır kimi tanınan mərd igidlər" və "qılınc çalıb ad çıxaran oğlanlar" səltənət taxtının arxasında sağ tərəfdə, kəşfiyyat başçıları isə sol tərəfdə əyləşirlər. "Buyurdum ki, qoşunun o bölüyünün əmiri mənim qənşərimdə yer tutsun... xüsusi yasovulum isə böyük çadırın qapısı önündə, taxtımın ayağının qənşərində dik dayansın... Həmçinin hökm elədim ki..." yazan Əmir Teymur neçə ildən bəri başçılıq etdiyi böyük bir imperiyada şah hökmünün qətiliyini şahanə şəkildə bəyan edir (Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 88).

Deməli, Teymuri imperiyasında olduğu kimi mühüm məsələlərin həlli üçün şah divan çağırır, dövlət başçıları ilə məşvərət edir, onların rəy və təkliflərini dinləyirdi, amma şübhəsiz ki, həlledici söz şahın olardı. Məsələn, mənbədə oxuyuruq: «Böyük əmir (Qara Osman Ağqoyunlu – Ş.F.) dövlətin vəzirləri, əmirləri, əyanları, sərkərdə və qoşun başçıları ilə İskəndər Mirzənin (Qara Yusifin oğlu – Ş.F.) qarşısını almaq barədə məşvərət etdi».[46] Yaxud «Sahibqran (Uzun Həsən – Ş.F.) atına minib divanxanaya getdi. Əmirlər, saray əhli, əyanlar və qoşun başçıları sultanın hüzuruna tələsdilər».[47]

Qeyd olunmalıdır ki, hər bir müqtədir Qaraqoyunlu, Ağqoyunlu və Şirvan hökmdarı səltənətdə necə uzun müddət qalmağın üsul və şərtlərini öyrənmiş, onların nisbətən qüdrətliləri dövləti uzun müddət idarə etmiş, zəiflərinin hakimiyyət dövrü isə az olmuşdu. Qüdrətli Azərbaycan hökmdarları sanki Əmir Teymurun məlum əsərini oxumuş, öz

[46] Kitabi-Diyarbəkriyyə, səh.79-80.
[47] Yenə orada, səh.139.

dövlətlərini necə idarə etməyi o böyük əmirdən öyrənmişlər. Əmir Teymurun əsərində oxuyuruq: "On iki şeyi özümə şüar etdiyimə görə, səltənət taxtında tam müstəqilliklə əyləşdim.Öz təcrübəmdə sınayıb öyrəndim ki, hansı padşah bu on iki şərtə əməl edə bilməsə səltənətdən heç cür yarıya bilməyəcəkdir." *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 61).* İndi görək həmin "on iki şərt" nədir və nələri ehtiva edir. Əmir Teymur yazır:

1. Hökmdar gərək öz sözünün yiyəsi olsun, bildiyi işin arxasınca getsin.

2. Sultan hər şeydə ədalətli olmalı, yanında ədalətli, insaflı vəzirlər saxlamalıdır.

3. Bütün məmləkətdə buyruq-fərman vermək ixtiyarı padşahın özündə olmalıdır ki, hər işdə padşah özü hökm çıxartsın, heç kim onun işinə qarışıb, hökmünü dəyişdirməsin.

4. Padşah bir işi görmək qərarına gəlmiş olsa, həmin işin üstündə möhkəm dayansın, işi bitirməyincə ondan əl çəkməsin.

5. Nə cür hökm çıxarmış olsa belə padşahın öz hökmünü yeritməsi zəruridir.

6. Padşahlıq işlərini büsbütün başqasına tapşırmaq, ixtiyarı özgəsinin öhdəsinə buraxmaq olmaz. Dünya ayağı sürüşkən qadın kimidir, onun aşiqi çoxdur. Əgər padşah öz səltənətinin ixtiyarını başqasına vermiş olsa, onun iştahından padşahlıq keçəcək, gözünü səltənət taxtına yiyələnməyə dikəcək.

7. Səltənət məsələləri ilə bağlı olaraq hamının sözünü eşitmək, hər bir adamın fikrini öyrənmək lazımdır. Daha faydalı məsləhətləri könül xəzinəsində saxlamaq, məqamı gələndə xərcləmək lazımdır.

8. Səltənət işlərində hərbi qulluqçularla, rəiyyətlə bağlı məsələlərdə başqalarının sözlərinə və əməllərinə baxıb ölçü götürmək olmaz. Vəzirlər, əmirlər bir adamın haqqında yaxşı-yaman söz söyləmiş olsalar, onları dinləmək lazımdır, lakin ölçü götürməkdə tələsmək olmaz, çatdırılan söz sınanmalı, yoxlanmalı, həqiqət ortaya gətirilməlidir.

9. Padşahın zəhmi hərbçilərin və rəiyyətin üzərində elə



yer tutmalıdır ki, heç kəs onun əmrinin, fərmanının əlehinə gedə bilməsin, ona itaət və tabeçilik göstərsinlər, başlarını qaldırmasınlar.

10. Padşah nə eləsə öz iradəsincə eləməlidir, hər nə desə sözünün üstündə möhkəm durmalıdır, çünki padşahların hökmlərindən başqa bəhrələnəcəkləri şey yoxdur. Padşahın padşahlığı hökmündədir. Xəzinə, qoşun, rəiyyət, səltənət - bunların hamısı onun hökmünə tabedir.

11. Səltənət məsələlərində və hökm yürütməkdə padşah özünü tək saymalıdır, hər kəsi özüylə bərabər səltənətə şərik etməməlidir.

12. Padşah məclis (divan - Ş.F.) əhlindən agah olmalı və ayıq-sayıq olmalıdır ki, ətrafındakılar ondan daha çox ayıb axtararlar, səltənətin içinin sirrini bayıra çıxararlar, padşahın sözünü, əməlini vəzirlərə, əmirlərə xəbər verərlər. Məsələn, buna oxşar bir hadisə mənim başıma gəlib. Özümün məxsusi məclisimdəki həmsöhbətlərimdən bir neçə nəfəri vəzirlərimlə əmirlərimin casusları imişlər. *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 62-63.)*

Əmir Teymur tərəfindən dövlətin idarə olunması naminə nəzərdə tutulan bu 12 amil, şübhəsiz ki, güclü Azərbaycan hökmdarları üçün də düsturul-əməl olmuş, Qaraqoyunlu, Ağqoyunlu və Şirvan padşahları dövlətçiliyə dair kitablar oxumuş, təlimatlanmış, arif şəxslərlə söhbətlər etmiş, hikmət sahiblərindən hikmət dərsi öyrənmiş və yuxarıda sadalanan 12 (bəlkə də daha çox) amilə ciddi əməl etmişlər.

Şah adətən dövlətin paytaxt adlanan baş şəhərində yaşayırdı. Əgər onun qışlaq və yaylaq yerlərinə getməyi nəzərə alınmazsa, əsasən müharibələr vaxtı şəhəri tərk edirdi. Məsələn, Qaraqoyunlu və Ağqoyunlu şahları vaxtlarının çoxunu Təbrizdə, Şirvanşahlar isə Şamaxıda keçirmişlər.[48] Bəzən kütləvi ölümlərə səbəb olan xəstəliklərə görə də şah müvəqqəti olaraq şəhərdən çıxırdı. 1437-ci ildə Təbriz vilayətində taun yayıldığı üçün Cahanşah Qaraqoyunlu gedib

[48] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.43.

bir müddət Bərdədə qalmışdı.[49] Biri digərindən asılı olan dövlət başçıları arasında «Şərtnamə» adlanan sənəd yazılır və həmin asılılıq nəzərə çatdırılırdı. Belə ki, 1488-ci ildə Şirvanşah Fərrux Yəsar və Yaqub Ağqoyunlu arasında yazılmış «Şərtnamə»də birinci tərəfin asılılığı aydın nəzərə çapır: «... Söz verirəm dostun olum, səninlə yaxşı davranım, vəd etdiyim beş min Təbriz tüməni məbləğində pulu hər il gecikdirmədən göndərim».[50]

Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində şahın başqılaq etdiyi hakim sinif tərkib baxımından müxtəlif idi və aşağıdakı tayfalardan ibarət olmuşdur:

a) Qaraqoyunlulara tabe olmuş tayfalar: yivə, barani (baranlu), qaraqoyunlu, sədlu, bayburtli, vərsaq, oxlu, qaracadağlu, baharlu, qaramanlu, əlpavut, cağirlu, hacılu, ağacəri, bayramlu, dügər (dügərlu).

b) Ağqoyunlulara tabe olan tayfalar: bayandur, əfşar, bozçulu, bayat, qacar, çəpəni, əmizlu, əhmədlu, şamlu, mosullu, xunuslu, pornak, begdeli, ərəbgirlu, eynallu, bicənlu, heydərlu, təkəlu, tabanlu, düharlu, ördəklu, çavundur, rumlu, turkman, şixavənd.[51]

Özlərindən 7-8 əsr əvvəl mövcud olmuş müsəlman dövlət başçıları kimi Qaraqoyunlu, Ağqoyunlu və Şirvan dövlət başçıları da öz hərəkətlərində daim islam dininə söykənmişlər. Şübhəsiz ki, hökmdarların hər biri öz imkanları daxilində daha geniş ərazilərə sahib olmaq barədə düşünmüş və bu istiqamətdə addımlar atmışlar. Qaraqoyunlu və Ağqoyunlu sultanlarına nisbətən daha kiçik əraziyə və az saylı qoşuna malik olan Şirvan şahları isə (Şirvanşah I İbrahimin XV əsrin əvvəlindəki istəyinin əksinə olaraq) başqa dövlətlərin torpaqları hesabına daha böyük hakimiyyətə çatmaq uğrunda mübarizə aparmırdılar. Amma bunun əksinə

[49] Yenə orada, səh.139.

[50] Həsən bəy Rumlu. Əhsənüt-təvarix (Bax: Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...) səh.43

[51] Tarixi-qızılbaşan, Tehran, h 1361, səh.35-40; Tofiq Nəcəfli. Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin tarixi müasir türk tarixşünaslığında, Bakı,2000, səh.184-188.



olaraq Əmir Teymur, Sultan Bayazid, Qara Osman, Qara Yusif, Cahanşah, Uzun Həsən kimi hökmdarlar daim daha böyük ağalıq arzusunda olmuşlar. Şərəfəddin Əli Yəzdinin "Zəfərnamə" kitabında bu xüsusda Əmir Teymura xas belə cümlə vardır:

"Dünya elə böyük bir yer deyildir ki, orada iki nəfər padşah olsun. Dünyanı bircə Allah yaratmışdır və dünyada bir hökmdar olmalıdır." *(Bax: "Амир Теймур в мировой истории" kitabı, Parij, 1996, səh. 40).*

Şahzadə. Şah vəfat etdikdə, bir qayda olaraq, araya çaxnaşma düşür, başqa ölkə hökmdarları, yaxud şahın evladları, xüsusilə qüdrətli əmirlər və başqa yüksək vəzifə sahibləri taxt-tacı öz xeyirlərinə ələ keçirməyə çalışırdılar.[52] Amma bir qayda olaraq hələ şahın sağlığında şahzadələr içərisində ən böyüyü şah tərəfindən vəliəhd elan edilirdi. «Kitabi-Diyarbəkriyyə»də oxuyuruq: «Sən böyük evladsan, qayda belədir ki, gərək padşah sən olasan».[53] Yaxud, «Öz böyük atası (Qara Osman Ağqoyunlu – Ş.F.) tərəfindən Əli bəy vəliəhd təyin edilmişdi. «Camaat onu itaətlə qəbul etdi. Ədalət və qanunla rəiyyəti idarə etməyə və qorumağa, qoşun və sərhəd qaydalarını nəzərə alıb hakimiyyətə başladı».[54]

Dövlət işlərində təcrübə əldə etməkdən ötrü şahzadələr vilayətlərə hakim təyin edilir və beləliklə bir növ «sınaq dərsi» keçirdilər. Hakim şahzadəyə hakimiyyət rəmzi kimi təbil, qoşun və bayraq verilirdi. Azyaşlı şahzadə isə bir qayda olaraq «lələ» adlanan və onun təlim-tərbiyəsi ilə məşqul olan əmirə tapşırılırdı.[55]

Araşdırdığımız mənbələrdə şahzadələr haqqında müəyyən fikirlər söylənilmiş, onların səlahiyyətləri xüsusunda danışılmışdır. Əmir Teymur öz şahzadələri ilə necə davranması barədə yazır: "Əmr elədim ki, əgər oğullarımdan hansı biri səltənətə yiyələnmək iddiasıyla başını qaldırarsa,

[52] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.43.

[53] Kitabi-Diyarbəkriyyə, səh.85.

[54] Yenə orada, səh.81.

[55] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.44.

onu döyüb-söyməyə, öldürməyə, yaxud da bədəninin bir hissəsini kəsib götürməyə heç kəs cürət etməsin. Lakin onu öz iddiasından dönənə qədər göz altında saxlasınlar ki, tanrıtaalanın mülkündə fitnə-fəsad törənməsin. (Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 67") Teymurləng bu məslədə hətta şahzadələrin oğulları və özünün başqa qohum-qardaşları ilə də necə davranmaq barədə vəsiyyət etməyi unutmur:

"Əgər nəvələrim, qohum-qardaşlarım düşmənçilik eləsələr, onların məvacibini kəsərək dərviş kökünə salsınlar" (Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 67)

Amma, qeyd olunmalıdır ki, bu kimi məsələlərdə Qaraqoyunlu və Ağqoyunlu hökmdarları daha qəddar olmuşlar. Məsələn, Cahanşah Qaraqoyunlu oğlu Pirbudağı qətl etmiş, Uğurlu Məhəmməd Ağqoyunlu isə atası Uzun Həsənin qəhr və qəzəbinə gəlib öldürülmüşdür.

Lələ: O, şah tərəfindən rəsmən təyin edilir və şahzadənin bütün hərbi, mülki və maliyyə işlərini onun adında idarə edirdi. Məsələn, Cahanşah Qaraqoyunlu İsfahan əyalətini oğlu Məhəmmədi Mirzəyə verərkən «şahzadə həddi-buluğa çatmadığı üçün» əyalətin bütün işləri Lələ Məhəmmədə tapşırılmışdı. Bu lələnin vəfatından sonra isə həmin Qaraqoyunlu şahzadəsinin lələsi sabiq lələnin qardaşı Lələ Səfərşah olmuşdu.[56]

Qaraqoyunlu dövlətinin ilk illərinin təsvirini verən tarixçi Həsən bəy Rumlu «lələ» istilahını «atabəy» kimi işlətmiş və Qara Yusifin oğlu Pirbudağın Əmir Qara adlı atabəyinin adını çəkmişdir.[57]

Lələ adlı-sanlı əmirlərdən təyin edilirdi. Ağqoyunlu dövlətində böyük rol oynamış Əmir Sûfi Xəlil bir müddət şahzadə Baysunqurun (hakimiyyət illəri 1490-1492) lələsi və «mürəbbisi» olmuşdu.[58] Əmirin lələliyə keçirilməsi üçün xüsusi fərman verilir və bu təyinat lələ tərəfindən böyük hadisə kimi qiymətləndirilirdi, çünki azyaşlı şahzadəyə lələ

[56] S.Onullahi. Göst.məq. səh.38.
[57] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə…,səh.44.
[58] Tarixi-qızılbaşan, Tehran, səh.17



təyin edilən əmirin böyük də səlahiyyətləri olurdu. Şahzadə lələdən ötrü gəlir vasitəsi idi.[59]

**Əmirül-ümərа:** XV əsrdə Azərbaycanda dövlətin idarə olunmasında ən mötəbər vəzifələrdən biri «əmirül-ümərа» («əmirlər əmiri») vəzifəsini daşıyan hərbiçiyə məxsus olmuşdur. Əmirül-ümərа ölkənin hərbi quvvələrinə başçılıq edirdi.[60] XVl əsr Azərbaycan tarixçisi Həsən bəy Rumlunun qiymətli «Əhsənüt-təvarix» («Tarixlərin ən yaxşısı») salnaməsində və dövr hadisələrini əks etdirən başqa mənbələrdə olduğca böyük səlahiyyətə malik olan əmirül-ümərа vəzifəsinin sahibi «məlikül-ümərа, məliki-əzəm, əmiri-bozorg, əmiri-əzəm adlandırılmış»[61] və «ölkə işlərinin idarəsinin» (təbii ki, hərbi işlərin – Ş.F.) onun əlində olduğu göstərilmişdir. Həsən bəy Rumlu yazır ki, əmirül-ümərаya məxsus olan möhür «ali divanın başqa möhürlərindən yuxarıda vurulurdu».[62]

Əmirül-ümərаlar və əmirlər barədə öz əsərində ehtiramla danışan Əmir Teymurun əmirlərə və əmirlik vəzifəsinə xüsusi diqqət və qayğısı olmuşdur. Elə özü də "şah", "padşah", "sultan" titulunu qəbul etməyib, sadəcə "əmir" adlanan Teymurləng yazır:

"Öz başımın çəkdiklərindən sınayıb bildim ki, müharibənin sirlərini, düşmən əsgərlərini sındırmağın yolunu bilən, döyüş qızışanda gözdən yayınaraq əl-ayağı boşlamadan əsgər bölüklərini döyüşə gətirən, qoşunun cərgələrinə qarışıqlıq düşdüyü hallarda onu tezcə qaydaya salmağı bacaran adam əmirliyə və hökmdarlığa layiq sayılmalıdır." Əmir Teymurun əmirül-ümərа mənsəbində görmək istədiyi adamda məhz indicə yuxarıda sadalanan hərbi keyfiyyətlər olmalı və yalnız

[59] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə…,səh.44-45.
[60] Сборник статей по истории Азербайджана, стр.198: Д.М.Ибрагимов. Феодальные государства…, стр.77.
[61] Həsən Rumlu. Əhsənüt-təvarix, Tehran, h.1349, səh126,235; Tarixçi Budaq Qəzvini də bu fikirdədir (Bax: Cəvahirəl-əxbar, M.Y.Saltıkov-Şedrin adına Leninqrad Dövlət Kütləvi Kitabxanasının Əlyazmalar şöbəsi, Dornun kataloqu №288, səh.288).
[62] Həsən Rumlu. Əhsənüt-təvarix, Baroda, 1931, səh.185.

bu keyfiyyətlər nəzərə alınmaqla ona ən yüksək titul olan əmirül-üməralıq verilməlidir: "Bu cür adam mənim olmadığım xeyirdə-şərdə müavinim olaraq şan-şövkət ilə əsgərlərimin hamısına buyruq verməyə, dikbaşlıq edənləri cəzalandırmağa səlahiyyəti çatan əmirül-ümərə rütbəsinə layiqdir" cümləsi ilə bu cığatay hökmdarı əmirül-ümərani özünə müavin hesab edir *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 73)*

Əmirül-ümərə vuruş meydanını seçərkən dörd məsələni nəzərdə tutmalı idi:

1. Həmin yerdə su olub-olmadığını;
2. Əsgərlərin saxlandığı ərazini;
3. Düşmən əsgərlərinin yerləşdiyi yerdən bir qədər yüksəkdə olmağı;
4. Vuruş meydanının qarşısının geniş və açıq olmasını; *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 101)*

Teymurilərin ordu quruluşunda əmirül-ümərə ən böyük hərbi rütbə sayıldığından, müvafiq olaraq hərbiçilər arasında ən çox maaş almaq haqqı da ona mənsub idi: "Əmr elədim ki, əmirül-ümərənın maaşı öz əlinin altındakılarından on dəfə artıq olsun" *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh 65)*

Qaraqoyunlu dövlətinin ilk vaxtlarında bu dövlətin əmirül-ümərələrı Bəstam Cagirlu[63] və Əmir Qaraman[64] olmuş və onlar müxtəlif vaxtlarda bu möhtəşəm vəzifəni icra etmişlər. İllər ötdükcə şahlar kimi əmirül-ümərələr da dəyişilmiş, amma bu yüksək mənsəb yenə də idarəçilikdə aparıcı rollardan birini oynamışdır.

Əmirül-ümərə Əmir Qaraman barədə mənbədə belə bir məlumat vardır: «Qara Yusifin hakimiyyəti zamanı Əmir Qaraman bütün əmirlərdən böyük idi». Yenə həmin mənbədə göstərdiyinə görə yuxarıda adı çəkilən Əmir Bəstam Cagirlu[65]

[63] Yenə orada, səh.107.
[64] Yenə orada, Tehran nəşri, səh.37, 46.
[65] Yenə orada, səh.115. Qeyd: Onların (Cağirlu tayfasının – Ş.F.) əzəmətli əmiri Əmir Bəstamdır. O, illərlə Qara Yusif Türkmanla döyüşdü, nəhayət ki, onun əmirül-ümərəsı oldu. (Bax: Tarix-qızılbaşan, səh.37) Deməli bəzən əmirül-ümərə olmaq naminə padşahla döyüşmək də lazım imiş.



əmirül-ümərəlığa özünün ciddi mübarizəsi nəticəsində çata bilmişdi ki, bununla da bu vəzifənin üstünlüyü nəzərə çarpır. Mösullu tayfasından çıxmış «mötəbər» «əzəmətli» və «böyük» əmirlər barədə mənbədə oxuyuruq:

Mosullu tayfası: Onların mötəbər əmiri Taş bəy (Bəktaş bəyin oğlu Əmir bəy – Ş.F.) Həsən padşahın (Uzun Həsənin – Ş.F.) əmirül-ümərəsı idi. O, Sultan Əbu Səidin (teymuri sultani – Ş.F.) əmirləri ilə çoxlu döyüşmüş, Toqat şəhərini yandırmışdı. Oğlu Gülabi bəy də əzəmətli əmir (əmiri-müəzzəm) idi... Mosulluların başqa bir nümayəndəsi Əmir bəyin qohumu Sufi Xəlildir. Yaqub padşahın zamanında böyük əmir (əmiri bozorg) oldu. Padşahın vəfatından sonra o, bayanduri şahzadələrinin əksəriyyətini qətlə yetirdi. Nəhayət Van qalası yaxınlığında Süleyman bəy Bicənin əli ilə öldürdü. O, tayfanın başqa mötəbər əmiri (əmiri-mötəbər) Əmir xandır ki, o, «şahı-dinpənahın» (dinin pənahı) olan şahın (burada I Şah İsmayıl nəzərdə tutulur – Ş.F.) hakimiyyəti dövründən qabaq Bağdad valisi idi ki, onu Zülfüqar bəy öldürdü... Mosulluların başqa əmiri Əmir xan ibn Məhəmmədi bəy ibn Gülabi bəy ibn Əmir ibn Bəktaş bəydir ki, Təbrizin əmirül-ümərəsı idi.

Pornak tayfası: Bu tayfanın əzəmətli-əmiri Şahəli bəy idi ki, Həsən padşahın vaxtında tam iqtidara malik idi... Bu tayfanın başqa mötəbər əmiri Murtuzaqulu xandır ki, müqəddəs Məşhədin əmirül-ümərəsı idi... Başqası Həsən bəy Şükür oğluydu ki, Rüstəm padşahın zamanı Muğan və Qaracadağ əmirül-ümərəsı olmuşdu.[66] Baysunqur Ağqoyunlunun (hakimiyyət illəri: 1490-1492) əmirül-ümərəsı olan Fərrux bəy böyük nufuz sahibi idi.[67]

Bəzən hökmdar əmirül-ümərənın istəyinə qarşı çıxa bilmir və onun rəyi ilə istər-istəməz hesablaşmalı olurdu. Belə ki, Qara Yusif Qaraqoyunlu əsir aldığı Cəlairi hökmdarı Sultan Əhmədi öldürmək istəmədiyinə baxmayaraq, əmirül-ümərə

[66] Tarixi-qızılbaşan, səh.21-23,37. Qeyd: Göründüyü kimi bu mötəbər, əzəmətli, böyük əmirlərin əksəriyyəti əmirül-ümərə olmuşlar.
[67] Həsən Rumlu. Əhsənüt-təvarix, Tehran nəşri, səh.630.

Bəstam Cagirlunun istəyinə qarşı durmaqdan çəkinmiş və ölüm hökmünü vermişdi.[68] Mənbənin göstərdiyinə görə əmirül-üməra dovlətdə «ixtiyar sahibi» idi.[69] Bəzi ali dövlət vəzifələri olan əmirül-ümərа və divan əmiri vəzifələri eyni bir şəxs tərəfindən idarə olunurdu. Ə.Tehrani yazır: «Cahanşah Mirzə Təbrizdə... əmiül-ümərа və sahibi-divan olan Şahəli Bayramini bir neçə xəyanətdə ittiham edib həbsə aldı».[70]

Türk tədqiqatçısı Xəlil Yınanca görə əmirül-ümərа (əmiri-əzəm) nufuzlu divan işçisi olub, hökmdarın şəxsən iştirak etmədiyi hərbi yürüşlərdə baş komandan vəzifəsini icra edirdi. Onun fikrincə XV əsrdə bəylərin ən böyüyü məhz əmiri-əzəm olmuşdur.[71]

Bu qeydlərdən məlum olur ki, XV əsr Azərbaycan dövlətlərində padşahdan sonrakı ikinci şəxs məhz əmirül-ümərа olmuşdu. Şah hər hansı səbəbdən ölkədən çıxdıqda əmirül-ümərа onu əvəz edirdi. «Tüzukati-Teymuri» əsərində yazılır: «Əmirül-ümərа o adam ola bilər ki, məclisdə və vuruşmada mənim müavinim olsun və bacarıqla qoşunu idarə edə bilsin, ona kimsə müxalifət etsə, cəzalandırmağı bacarsın». Əmirül-ümərаnın hökmü əmirlər və qoşunun digər hərbi rütbəli və qeyri rütbəli məmurları üçün qanun idi.[72] Bəzi əmirül-ümaralar hətta öz hökmdarına qarşı çıxırdılar. Əmirül-ümərа Bayandur bəy 1482-ci ildə Sultan Yaqub Ağqoyunluya, əmirül-ümərа Süleyman bəy Bicən isə Sultan Xəlil Ağqoyunluya qarşı vuruşmuşlar.[73]

**Əmir-divan:** yaxud sahib-divan, divanbəyi. Uzun Həsən Ağqoyunlunun hakimiyyəti zamanı dövlətin idari təşkilatının mərkəzi böyük divan idi. Divan rəisi «əmir-divan», «sahib-divan», yaxud «divanbəyi» adlanırdı. Böyük divanın nəzdində kiçik divanlar da fəaliyyət göstərirdi. Məsələn, təftiş divanı,

[68] Yenə orada, səh.68.
[69] Yenə orada, səh.126,184.
[70] Kitabi-Diyarbəyriyyə, səh.213. Qeyd: S.M.Onulluhi bu əmirin adını Əmir Əli kimi göstərir (Bax: S.M.Onullahi. Göst.məq. səh.39).
[71] İslam ensiklopediyası, I cild, səh.226.
[72] S.Onullahi, Göst. məq., səh.39.
[73] Yenə orada.



tuğra və ya nişan (şah sənədlərinin qeydiyyatdan keçirilib möhürlənməsi) divanı, maliyyə divanı, ədl və ərz (məhkəmə və hərbi işlər) divanı (bu divana ərizi də deyilirdi). Divan üzvləri adətən səltənət xanəndanına mənsub və ya boy rəisləri olan böyük bəylərdən olurdu. Bu divanların hamısının nəzarəti əmir-divan tərəfindən həyata keçirilirdi.[74]

Professor O.Ə.Əfəndiyev Qaraqoyunlu və Ağqoyunlu dövlətləri mülki təşkilatına nəzər yetirib həmin dövlətlərdə fəaliyyət göstərən divanlar içərisində 5 divanın adını çəkir: Divani-əmarət, divani-vəzarət, divani-təvaçi, divani-pərvanəçi, divani-ləşkər (Bax: "Yeni Türkiyə" elmi araşdırmalar jurnalı, 8-ci il, 45-ci say, Ankara, 2002, səh.73). Təbii ki, bu divanların hamısının ümumi nəzarəti divanbəyi tərəfindən icra edilirdi.

Teymurilər dövlətində vəzirlər divanbəyiyə tabe idilər. Əmir Teymur yazır: "Bu yeddi vəzir divanbəyiyə tabe olmalı və onunla birlikdə mühüm maliyyə işlərini həll edərək mənə məlumat verməli idilər." *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 82).* Əgər divanbəyinin icazəsi olmasaydı əmirül-ümərа və əmirlər xəzinədən öz maaşlarını ala bilməzdilər. Dövlət tərəfindən ödənilən maaşların hesabatını divanbəyi hökmdara təqdim edirdi. *(Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 65).* Mənbələrdə əmir-divanın daşıdığı vəzifənin məzmunu barədə hələlik müəyyən bir məlumatın olmadığını bildirən V.F.Minorski onun xüsusi divanı olduğunu bildirib yazmışdır ki, onun divanı həm sədrin, həm də vəzirin divanlarından üstün olmuşdur. Doğrudan da heç bir mənbədə, həmçinin bizim tərəfimizdən geniş istifadə edilən «Kitabi-Diyarbəkriyyə»də də əmir-divanın vəzifəsinin müstəqim şərti yoxdur, lakin bu əmirin digər əmirlərdən yüksəkdə duraraq böyük ixtiyara malik olması məlumdur.[75]

Qaraqoyunlu hakimiyyətinin başlanğıcında əmirül-ümərа kimi yüksək vəzifəni ələ keçirmək uğrunda Qara Yusiflə «cəngə» başlayan Əmir Bəstam Caqirlunun oğlu Əmir

[74] İslam ensiklopediyası, I cild, səh.226.
[75] Yenə orada; Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə..., səh.61.

Bayandur hökmdar Cahanşah Qaraqoyunlunun əmir-divanı olmuş, onun vəfatından sonra bu böyük vəzifə, onun qardaşı Əbülfət bəyə verilmişdi. Deməli bu misaldan belə qənaətə gəlmək mümkündür ki, divan əmiri vəzifəsinin bir tayfanın şəxsində (Burada cağırlu tayfasının – Ş.F.) müəyyən mənada irsi xarakteri olmuşdur[76].

Bəzi mənbələrdəki məlumatlar belə deməyə əsas verir ki, dövlətin əmir-divanından başqa ayrı-ayrı vilayət, şəhər və qalaların da divan əmirləri olmuşdur. Məsələn, 1408-ci ildə Əlincə qalasında baş verən qiyam yatırıldıqdan sonra qalanın yeni hakimi olan Qara İskəndər üsyan başçılarından biri olan Şəhriyarı divan əmiri etmişdi. Qaraqoyunlu dövlətinin başçılarından biri Qara Yusif olduğu halda Şəhriyarı divan əmiri vəzifəsinə sülalə başçısı deyil, məhz şahzadə İskəndərin təyin etməsi faktı onu göstərir ki, İskəndər ona təhvil verilən Əlincəni öz mülkü hesab etmiş və qala divanının başçılığına atası ilə məsləhətləşmədən Əmir Şəhriyarı təyin etmişdi. Digər Qaraqoyunlu şahzadəsi Pirbudağın Bağdaddakı divan əmirinin Mir Əli Şükür adlı əmir olması da məlumdur.[77] «Kitabi-Diyarbəkriyyə» də əmir-divanın möhtərəm bir dövlət işçisi olduğunu nəzərə çatdırır: "Sahibqran… ali divanın əmiri, dövlət dayaqlarından biri, ağıllı, müdrik və təcrübəli Əmir bəyi Şiraza hakim təyin etdi."[78] Ə.Tehraniyə görə, bəzən bir dövlətin bir yox, iki əmir-divanı olur və bu vəzifə şərikli icra edilirdi.[79]

<u>Vəkil:</u> XV əsr Azərbaycanda feodal dövlətlərinin idarə olunmasında vəkilin də xüsusi rolu olmuşdur. O, şah adından çıxış edir, bəzi hallarda şahın əvəzçisi kimi əmirül-ümərа ilə birlikdə hərbi səfərlərə də çıxırdı. Qaraqoyunlular 1411-ci ildə Ərzincana hucum edən vaxt Qara Yusif bu hərbi yürüşün çox uzandığını görərək oranı ələ keçirməyi öz vəkilinin öhdəsinə qoymuş və özü geri qayıtmışdı. Bəhs olunan dövrdə,

[76] Tarixi-qızılbaşan, səh.37
[77] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə…,səh.61
[78] Kitabi-Diyarbəyriyyə, səh.287.
[79] Yenə orada, səh.171.



xüsusilə Qaraqoyunlular vaxtı mənbələrdə tez-tez «vəkil» sözü əvəzinə «vükəla» (vəkillər) işlədilir ki, bunun da, şübhəsiz səbəbi vardır. O vaxtlarda hərbi yürüşlər zamanı orduya başçılıq bir neçə şəxs tərəfindən icra olunduğu üçün hökmdarın adından hərəkət edib, müəyyən tapşırığı yerinə yetirən məsul şəxslər «vükəla» adlanmışlar. İndi görək Qaraqoyunlu dövrünə aid olan «vükəla» ifadəsi sonralar Ağqoyunlu və Səfəvi dövlətlərində mühüm əhəmiyyət kəsb edən «vəkalət» kimi ali vəzifənin icraçılarına aiddirmi? Əsla yox! Çünki Qaraqoyunlular dövründə vəkalət bir vəzifə kimi hələ formalaşmamışdı. Bu fikri Qaraqoyunlu dövlətinin təsviri zamanı müxtəlif mənbələrdə vəkalət vəzifəsinə əhəmiyyət verilməməsi ilə izah etmək olar. Doğrudur, yuxarıdakı misaldan da vəkillərin şah əvəzçiləri kimi fəaliyyətləri məlum oldu, lakin şübhəsiz ki, həmin vəkillər sonralar böyük rolu olan Ağqoyunlu və Səfəvi vəkillərindən fərqli idilər.[80] Vəkalət vəzifəsinin formalaşması, fikrimizcə, Ağqoyunluların hakimiyyətdə olduğları zaman həyata keçmişdir. Məlumdur ki, bu dövlətə 12 il başçılıq edən Yaqub şahın vəkili Şeyx Nəcməddin Məsud olmuşdur. Bu şeyx XVI əsrin əvvəllərində yenicə yaradılan Səfəvilər dövlətinin də vəkili kimi fəaliyyət göstərmiş, Şah İsmayıl Səfəvinin ən etibarlı köməkçilərindən biri olmuşdur.[81]

«Əhsənüt-təvarix» əsərində verilən aşağıdakı məlumata əsasən Ağqoyunlu dövlətlərində vəkalət mənsəbi hətta bəzən əmirül-ümərаdan da üstün olubdur. Tarixi faktdır ki, Yaqub şahın öldürülməsindən sonra hakimiyyəti Əmir Sufi Xəlilin köməyi ilə şahzadə Baysunqur ələ almış və dövlətin əmirülümərası vəzifəsinə Fərrux bəy təyin edilmişdi. Gənc şahın adından dövləti vəkil kimi idarə etməyi əmirül-ümərа olmaqdan üstün tutan Sufi Xəlil o zaman məhz vəkaləti öz əlinə keçirmişdi.[82]

[80] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə…,səh.50.
[81] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə…,səh.50-51.
[82] Yenə orada, səh.50.

Bir mənbədə vəkil Sufi Xəlildən sonra Ağqoyunlu dövlətinin vəkili vəzifəsini ələ keçirən Süleyman bəy Bicən haqqında bu məlumat vardır: «Süleyman Bicən Diyarbəkrdən Sufi Xəlilə hücum etdi. Vanda tərəflər arasında cəng oldu ... Sufi Xəlil qətlə yetirildi və Süleyman onun əvəzinə Mirzə Baysunqurun (Yaqub Ağqoyunlunun oğlü – Ş.F.) cümlətul-məliki oldu.» Biz başqa mənbələrdə vəkilə «cümlətul-məlik» («baş məlik») kimi yüksək epitetin verildiyinə təsadüf etmədik.[83]

«Əhsənüt-təvarix»də vəkalət vəzifəsinin üstünlüyünü təsdiq edən başqa fakt da vardır: 1497-ci ildə Uzun Həsənin nəvəsi Gödək Əhməd (o, həmçinin II Sultan Məhəmməd Fatehin də nəvəsi idi) Ağqoyunlu Rüstəm şahı məğlub edib, taxt-tacı ələ keçirən vaxt Kirman valisi Eybə Sultan və Şiraz valisi Qasım bəy Pornak ona qarşı sui-qəsd hazırlamaq qərarına gəlmişdilər ki, Uzun Həsənin digər nəvəsi Sultan Muradı Şirvandan gətirib taxta çıxarsınlar və özləri yeni şahın vəkili olsunlar. Bu faktla o zaman vəkalət mənsəbinin böyük üstünlüyü nəzərə çatdırılır və eyni zamanda vəkilliyin bəzən müştərək icra edildiyi aydınlaşır. [84]

Orta əsr tarixçiləri vəkilə «iqtidar sahibi», «ixtiyar sahibi», vəkalət mənsəbinə isə «ali vəzifə», «şərəfli mənsəb» demişlər[85]. Vəkil «ölkənin ixtiyarlı adamı» da adlandırılmışdır.[86] Bacarıqlı vəkilin işə cəlb edilməsi zəruri və təxirəsalınmaz bir vəzifə kimi qarşıda dururdu. Belə ki, 1498-ci ildə qardaşı Məhəmmədi Mirzəyə qalib gəlib, yenidən Təbrizdə taxta çıxan Əlvənd Ağqoyunlunun ilk işi özünə vəkil təyin etmək olmuşdu və o Lətif bəy adlı məşhur bir əmiri özünün vəkili elan etmişdi.[87]

Ə.Tehraninin məlum əsərində vəkilin bəzən hətta divan işlərinə başçılıq etməsi də göstərilir.[88]

---

[83] Bax:Tarixi-qızılbaşan, səh.18.
[84] Yenə orada, səh.50-51.
[85] Məsələn Xandəmir, Həsən bəy Rumlu, İskəndər bəy Münşi və s.
[86] Yenə orada, səh.51.
[87] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.51.
[88] Kitabi-Diyarbəkriyyə, səh.264.



**Baş vəzir və vəzirlər :** Mərkəzi dövlət aparatında mühüm yerlərdən biri də dövlət gəlirləri və maliyyə idarələrinin işləri ilə məşqul olan baş vəzirə məxsus idi. O, həmçinin ölkənin xarici işləri ilə də məşqul olur, səltənətin mülki-inzibati idarələrinə başçılıq edirdi.[89] Mənbələrin çoxunda baş vəzirə «etimadüd-dövlə» («dövlətin etimadı») deyildiyi göstərilmişdir ki, bununla da vəzirin böyük etimada layiq olduğu nəzərə çatdırılır. Baş vəzir «divana» rəhbərlik etdiyinə görə «divan sahibi» də adlandırılmışdır ki, bu məsələdə onunla, yuxarıda bəhs etdiyimiz «sahib-divan» yaxud «əmir-divan» vəzifəsi arasında nəsə bir ümumi yaxınlıq nəzərə çarpır. Ola bilsin ki, bu iki vəzifə bəzən eyni şəxs tərəfindən idarə olunmuş və biri-digərini əvəz etmişdi.[90] «Tarixi aləmarayi Əmini» əsərində göstərildiyinə görə Ağqoyunlu sarayında uzun müddət baş vəzir işləmiş, habelə Sultan Xəlil Ağqoyunlunun da vəziri olmuş Şah İmadəddin Salman Deyləmi «mülki və mali işləri» («cəhəti-kifayati-mühimmati-mülki və mali») tənzimləməkdən ötrü İraqa göndərilmişdi.[91]

Həsən bəy Rumlu da dövlətin bütün mali və mülki işlərinə rəhbərliyin baş vəzir tərəfindən həyata keçirildiyini bildirir. Vəzirin vəzifəsinə aşağıdakı işlər daxil idi:

a) divan gəlirlərinin artırılması;
b) dövlət tapşırıqlarının yerinə yetirilməsi;
v) inşaat və əkinçiliyin həcmcə artırılması;
q) döyüşçülərə və rəiyyətə diqqət göstərilməsi;
d) vilayətin abadlaşdırılması.[92]

---

[89] İ.P.Petruşevski, göst.məq. məcmuəsi, səh.198.
[90] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.51. Qeyd: Prof.S.M.Onullahi yazır : Baş vəzir ali divana rəhbərlik edir və buna görə də sahib-divan adlanırdı (Bax: Azərb.tarixi «Elm», III c.səh.105).
[91] Фазуллах ибн Рузбихан Хунджи. Тарих-и алам-арай-и Амини, Bakı, 1987, səh.47
[92] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə..., səh.53-54.

Maliyyə divanının bütün sənədləri baş vəzirin möhürü ilə möhürləndikdən sonra hüquqi sənəd kimi rəsmiləşdirilmiş hesab olunurdu.

Ayrı-ayrı hakim və şahzadələrin də vəzirləri olurdu. «Əhsənüt-təvarix»də Şirvanşah I İbrahimin Qazi Bayazid adlı bir vəzirinin adı çəkilmişdir. Şahzadə Qara İskəndərin vəziri Seyid Mahmud, Həsənəli Qaraqoyunlunun vəziri isə Xacə Şəmsəddin idi. Həsənəli 1458-ci ildə atası Cahanşaha xəyanət edərək Təbrizi tutmuş, az sonra atasının onun üstünə qoşun çəkdiyini eşidib şəhəri tərk etməyə məcbur olmuşdu. Təbrizi yenidən ələ alan Cahanşah oğlunun təqsirinin bağışlanmasından ötrü ilk növbədə onu bu işə sövq edən vəziri Xacə Şəmsəddini öldürməyi tapşırmış və Həsənəli əmri yerinə yetirmişdi. Bu misalla vəzirin şahzadə üzərində olan təsir gücü nəzərə çatdırılır.

Vəzir də vəkil kimi məşhur əmirlərdən təyin edilirdi. Cahanşahın qətlindən sonra Təbrizdə taxta çıxıb, bir neçə gün (bəlkə də ay) hökmranlığ edən Arayeş bəyim (Qara İskəndərin qızı – Ş.F.) Əlaəddin Sədiq Kecəcini özünə vəzir təyin etmişdi. Arayeş bəyimi məqlub edib yenidən taxta çıxan Həsənəli vəzir Əlaəddini vəzifəsində saxlamış, Əmir Aşur Məcidəddin İsmayılı da onunla birlikdə vəzir etmişdi. Görünür Həsənəlinin divanında baş vəzir Əlaəddin Sədiq Kecəci olmuşdur. Onun qohumu Şeyx Məhəmməd Kecəci isə Baysunqur Ağqoyunlunun vəziri idi.[93]

Vəzirlər hərbi yürüşlərdə də iştirak edir, onların xidmətləri yalnız mülkü və mali işlərdə məhdudlaşmırdı. Baş vəzirin ixtiyarında bir neçə min silahlı əsgər olurdu.[94]

Teymurilər dövlətində Əmir Teymuru, qüdrətli bir dövlət başçısı kimi vəzir vəzifəsini tutan şəxsin şəxsiyyəti daim düşündürmüşdür. O, dəfələrlə öz əsərində vəzir və vəzarət məsələlərinə qayıdır, övladlarına məsləhətlər verir: "Vəzir öz vəzifəsini saflıq, düzgünlük lə görməyə başlayarsa, dövlətin maliyyə, mülkiyyə işlərini dəyanətlə, savab ilə, nəfsinin qulu

---

[93] Yenə orada. səh.54.

[94] Yenə orada. səh.54-55.



olmadan, əmanətə xəyanət eləmədən yerinə yetirərsə, bu cür vəziri ən yüksək mərhələlərə yüksəltmək lazımdır. Hansı vəzir nəfsi pozuqluq eləyərək məmləkət işlərini yaman yola qoyarsa, çox keçməz ki, həmin məmləkətdən xeyir-bərəkət göyə çəkilər." (Bax: "Əmir Teymurun vəsiyyətləri" səh. 70-71)

Əmir Teymur ümumiyyətlə vəzirlər barədə çox danışır ki, bu da onun bu ali vəzifəyə böyük üstünlük verməsindən irəli gəlir: "Maliyyə vəzirləri maliyyə məsələlərində xəyanət eləyərək var-dövlətin bir hissəsinin arasına keçmiş olsalar, yoxlanılsın... Əgər mənimsənilən məbləğ mənimsəyənin maaşından üç dəfə artıq olarsa, onda maliyyə vəzirinin bütün malı, mülkü dövlətə hədiyyə sifətində əlindən alınsın." Əlbəttə, belə ciddi cəzalandırılan vəzir oğurluqdan çəkinər, dövlət malına əl uzatmaz. Əmir Teymur sərt cəzalar verməklə hakimiyyətdə olduğu müddətdə dövlət xəzinəsini son dərəcə zənginləşdirmişdi. Bunu da qeyd etmək yerinə düşərdi ki, Əmir Teymur "Tüzuki-Teymuri" əsərində təkcə vəzirlərin cəzalandırılmasından bəhs etmir, bacarıqlı və ləyaqətli vəzirlər barədə də müəyyən fikirlərini bildirir: "Tədbir və qılınc gücünə hər hansı məmləkəti zəbt eləyən, yaxud himayə eləyərək saxlayan vəziri əziz tutmaq, ona hörmət-izzət göstərmək lazımdır. Onun rütbəsini artırmaq, onu "qılınc və qələm" sahibi" adlandırmaq lazımdır. (Bax: "Göst əsər" səh.71)

Sədr : Dövlət idarəçiliyində tutduğu mövqeyə görə XVI əsr Səfəvi dövlətində əmirül-üməradan sonrakı yer sədrə məxsus olmuşdur. Lakin, XV əsr Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində sədarət mənsəbini aparan şəxsin rolu bir əsr sonrakı sədrin rolundan fərqlənir və elə də böyük üstünlüyə malik deyildi. Dövrün mənbələrində hətta XV əsr Azırbaycan feodal dövlətlərində vəkil və vəzirin mövqelərinin sədrə nisbətən daha üstün olduğu aşkar nəzərə çarpır və XV əsrin sonu istisna olmaqla sədrin fəaliyyəti, əsasən, göstərilmir. Buna baxmayaraq, tarixçilərin əksəriyyəti bu vəzifəni «yüksək

vəzifə» adlandırmışlar.[95] Həsən bəy Rumlu və başqalarının əsərlərində Qaraqoyunlu dövlətində sədrin oynadığı rol az işıqlandırmasına baxmayaraq, Ağqoyunlu dövlət aparatında sədrin icra etdiyi vəzifənin getdikcə ön plana çəkildiyinə işarə edilmişdir ki, bu da, zənnimizcə, dövlət işlərində dinin rolunun artması ilə əlaqədardır. «Əhsənüt-təvarix» əsərində Ağqoyunlu dövlətinin sədri Qazi İsa «sədarət mənsəbi və dini işlər vəzifəsinin sahibi» adlandırılır,[96] lakin bir müddət sədrlik edən bu şəxsin dövlətdə «ixtiyar sahibi» sayılan və vəkil olan Sufi Xəlilin fərmanı ilə öldürülməsi sədarət vəzifəsinin dövlətdə hələ o qədər də möhkəm mövqe tutmadığını göstərir.

Yeri gəlmişkən, sədr Qazi İsa və onun səlahiyyətləri barədə bir neçə söz: Məşhur tarixçi Fəzullah ibn Ruzbehan Xunci (Prof.S.M.Onullahi böyük iqtisadiyyatçı, tarixçi və şair olmuş Fəzlullah ibn Ruzbehanın təxəllüsünü onun doğulduğu "Xunəc" kəndi ilə əlaqələndirib "Xunəçi" kimi yazmışdır. Bizim bu iddiyaya qarşı etirazımız yoxdur, lakin S.M.Onullahidən başqa bütün alimlər F.Ruzbehanı "Xunci" kimi təqdim etdikləri üçün biz də həmin ifadəni "Xunci" kimi saxladıq – Ş.F.) öz tarix kitabında XV əsrin II yarısında Ağqoyunlu dövlətinin quruluşu və dövlət başçılarının siyasi fəaliyyətləri barədə olduqca faydalı məlumatlar vermişdir. Onun «Tarixi-aləmarayı-Əmini» adlı əsəri Uzun Həsən Ağqoyunlunun ölümündən sonrakı hadisələri, xüsusən Sultan Yaqubun (hakimiyyət illəri: 1478-1490) və Baysunqurun (hakimiyyət illəri: 1490-1492) həyat və fəaliyyətlərini ətraflı işıqlandırır, dövrün ictimai-iqtisadi məsələlərini qabarıq verir. Fəzullah Xuncinin məşhur Ağqoyunlu sədri barədə dediklərindən bir neçə cümləni misal gətirmək maraqlı olardı.

---

[95] Həsən Rumlu. Əhsənüt-təvarix, Baroda, səh.110. Qiyasəddin ibn Hümaməddin əl-Hüseyni əl-moddəu be Xandəmir. Tarixi-həbibüs-siyər, III cild, Tehran, h.1333, səh.549; Mirzə bəy əl-Həsən əl Hüseyni Cunabadi. Rovzətüs-Səfəviyyə (Azərb EA Tarix institutunun Elmi Arxivi, inv.№ 2614/5, vərəq 126-a.)

[96] Həsən Rumlu. Əhsənüt-təvarix, Tehran, səh.633.



Müəllif yazır: «Qazi İsa Sədrin Yaqub xan dövlətinin təməlinin qoyulmasında əvəzsiz iştirakı olmuşdur. Bütün vəzifə sahiblərinin təyinat və işdən çıxarılmalarında onun sözü həlledici idi. Hakimiyyətin cilovu tamamilə onun əlində idi... Qazi öz dərəcəsinin əhəmiyyətini olduqca qaldırdı. Onun razılığı olmadan heç bir dini, yaxud dövlət işi həll oluna bilməzdi. Əlahəzrətin (Sultan Yaqubun – Ş.F.) ona münasibətini görən adamların heç biri, heç bir məsələni əvvəlcə qaziyə təqdim etmədən həll edə bilməzdi. Buna görə də bütün şahzadələr, əmirlər, qazilər, vəzirlər və əyanlar tamamilə ondan asılı idilər. Zəngin və məşhur adamlar onu salamlamaq, ya da diqqətinə yetməkdən ötrü onun qapısı önündə yığılıb gözləyirdilər. O, nəfsani fəzilətlərlə bəzənən bir adam idi və dinin möhkəmlənməsi yolunda nə hökmdarlardan, nə də fırıldaqçı adamlardan (mütəqəllib) qorxub çəkinmirdi. O, Peyğəmbərin din bağçasını bəzəmək istəyirdi. Onun ən əsas məqsədi Çingiz yasalarının (qanunlarının – Ş.F.) qaranlıq pərdəsi altında gizlənən mülki işləri (ümuri-mülki) qaydaya salmaq idi. Həqiqətən də din çiçəkləndi, qazinin məsləhəti ilə üləmalar və ləyaqət sahibləri 1000 tümən və daha artıq məbləğ pul ilə mükafatlandırıldılar ki, əlahəzrət həmin pulu onlara soyurqal şəklində verirdi... Bu hal 894-cü ilin səfər ayının başlanğıcına qədər (yanvar 1489) davam etdi və Qaraağac qışlağında qazinin hakimiyyəti təxminən hökmdarın səlahiyyətinə yaxınlaşdı».[97]

Fərzullah Xunci yazır ki, Qazi İsa Sədr istəyirdi ki, qanuni maliyyə tədbirləri həyata keçirməklə tamğa adlı ticarət vergisini aradan qaldırsın, alış-veriş əməliyyatları genişlənsin, xəzinəyə gəlir gətirən mənbələr çoxalsın, «mal qapıları» (əbvab əlmal) açılsın.[98] Lakin, onun istəkləri həyata keçmədi və o Qarabağda olarkən vəkil Sufi Xəlil tərəfindən öldürüldü.[99]

---

[98] Yenə orada. səh.106.

[99] Yenə orada. səh.111. Qeyd: Qazi İsanın öldürülməsi barədə yuxarıda dəfələrlə istinad etdiyimiz belə bir məlumat vardır: «Sufi Xəlil... düşmənçilik etdiyi dəstəni aradan götürdü, o cümlədən sədr Qazi İsanı...

Bir daha xatırladaq ki, XV əsrin əvvəlində dövlətdə sədrin vəzifəsi məhdud idi və əsrin sonundakı sədrin vəzifəsindən, məsələn Qazi İsanın, xeyli az əhəmiyyət kəsb edirdi. Qaraqoyunlu dövlətinin tərkibində olan Bağdad əyaləti, «Əhsənüt-təvarix»də göstərildiyinə görə h.847 (m.1443/44)-ci ildə Cahanşah tərəfindən şahzadə Məhəmmədi Mirzəyə verilmiş, amma şahzadə azyaşlı olduğundan şəhər işlərinin idarəsi Abdulla adlı bir şəxsə tapşırılmışdı.[100] Müəllif Abdullanın vəzifəsinin adını göstərmirsə də, onun hökmdarın oğlu Məhəmmədi Mirzənin lələsi və sarayında sədarət mənsəbinin sahibi olduğu bilinir, lakin səfəvi sədrlərinin XVI əsrdə gördüyü işlərin ancaq ikisinin («həll və əqd» - yəni bir sıra işlərin «açılması və bağlanması») Qaraqoyunlu sədri Abdulla tərəfindən icra edilməsi o zaman sədrin fəaliyyətinin həqiqətən də məhdud olduğuna dəlalət edir.[101] Buna baxmayaraq, qeyd etmək lazımdır ki, sonrakı əsrlərdə olduğu kimi, XV əsr sədrlərinin də ən əsas vəzifələrindən biri dini işlərlə məşqul olmaq və vəqf idarələrinə rəhbərlik etmək olmuşdur.[102]

Beləliklə aydın olur ki, dövlətdə tutduqları məqam və daşıdıqları vəzifənin səlahiyyətinə görə qaraqoyunlu və ağqoyunlu sədrləri səfəvi sədrlərindən fərqli olmuşlar. «Nameyi-nami» əsərində də müxtəlif dövlətlərin sədrləri biri-birindən fərqləndirilir: «Sədrlərin vəzifəsi hər dövrdə və hər bir hökmdarın xidmətində müxtəlif olmuşdur»[103]

__**Hakim:**__ XV əsr Azərbaycan feodal dövlətləri tarixində hakimin də özünəməxsus yeri və fəaliyyəti olmuşdur. Göstərmək lazımdır ki, «hakim» də başqa istilahlar kimi həm geniş, həm də dar mənada işlənmişdir. Həsən bəy Rumlu bəzən şahları da hakim adlandırır. Məlumdur ki, şahın

həbs edib ordubazarda (əskər bazarı – Ş.F.) boğazını kəsdi. (Bax: Tarixi-qızılbaşan, səh.17-18).

[100] Həsən Rumlu. Əhsənüt-təvarix, Tehran, səh.250.

[101] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.48.

[102] Xandəmir. Nameyi-nami, Azərb.EA Əlyazmalar İnstitutunun kitabxanası, inv.№3583, vər.16a.

[103] Yenə orada, vər.42b.



tabeliyində olan ölkə, vilayət və şəhərlər həmçinin hakimlər tərəfindən idarə olunurdu. Onlar xüsusi fərmanla məşhur əmirlərdən təyin edilirdi. «Kitabi-Diyarbəkəriyyə»də oxuyuruq: «Cahanşah Mirzə Azərbacan hüdudlarından İraqa yaxınlaşdı və Xacə Mahmud Heydərin İsfahan hakimi təyin olunması barədə fərman göndərdi. Xacə Mahmud hakimlik vəzifəsinin icrasına başladı. Qış ötüb keçdikdən sonra Cahanşah İsfahanı öz oğlu Məhəmmədi Mirzəyə verdi».[104]

Hakimlər xəzinəyə hər il müəyyən miqdar vergi verir, şaha vaxtaşırı hədiyyə göndərir və müharibə vaxtı əsgəri quvvə ilə kömək edirdilər. Hakimlərin ən mühüm xüsusiyyəti onların hərbi quvvələrə başçılıq etmələrində idi. Hakim bəzən əlindən çıxarılan əyaləti «böyük xərclə» geri alırdı ki, bu da hakimin hakimiyyəti əlindən verməmək ehtirasını göstərir.[105] Tarixi mənbələrdə inzibati cəhətcə tutduqları yerə görə hakimlər bu dərəcələrə bölünmüşlər: vilayət, şəhər və qala hakimləri. Axırıncılara «kutval» da deyilirdi. Təyin olunduğu yerə gedən hakim özü ilə şahın təsdiq edib ona verdiyi hökm sənədini – «nişan»ı aparırdı. Nişanda adı göstərilən yerin ona çatdığı yazılır, əhalidən hakimi peşkəşlə qarşılaması, qala və xəzinə açarlarının təqdim edilməsi və ona sözsüz itayət olunması yazılırdı.[106] Hakimin vilayətdəki işləri barədə Ə.Tehraninin bir məlumatı dolğun təsəvvür yaradır. Söhbət Uzun Həsənin, onun yanına qaçıb sığınan teymuri Yadigar Məhəmmədi hakim təyin etməsindən gedir: «Sahibqran... padşahzadə Yadigar Məhəmməd Sultanı yanına çağırıb ona bayraq və təbil verdi... əmr etdi ki, Xorasana gedib öz irsi mülkündə hakimiyyət bayrağını ucaltsın... Şahzadə Məhəmməd bəy təyin olunduğu İsfahana çatdı və öz qədəmləri ilə o məmləkəti şərəfləndirdi. Şəhərin böyüklərinə və əyanlarına rütbələrinə uyğun hörmət və iltifat göstərdi. Vilayətin illərlə zülm və sitəm çəkmiş, qəm və kədər yükü altında inləyən əhalisində öz səxavətli və mərhəmətli təbiəti

[104] Kitabi-Diyarbəkəriyyə, səh.175.

[105] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.56.

[106] Yenə orada.

ilə ümid doğurdu. Təqribən bir ay müzəffər qoşunu təchiz etmək üçün İsfahanda dayandı. Divan məmurları vilayətin maliyyə işlərini qaydaya salmaq və vergiləri toplamaqla məşqul oldular. Mülkədar və rəiyyətlər həzrət sahibqranın günbəgün artan ədalətini görüb sevinclə bir ildə verməli olduqları vergini bir dəfəyə verdilər».[107]

Hakimə «daruğə» («darğa») da deyilmişdir ki, işləndiyi məna baxımından hakim və daruğə sözləri bir-biri ilə qarışdırılmamalıdır. XVl əsrdə bu iki istilah bir-birindən çox fərqlənmiş və daruğə hakimin əli altında olan şəxs kimi fəaliyyət göstərmişdir. XV əsr Azərbaycan feodal dövlətlərinin quruluşunda isə hər iki istilah təqribən eyni şəxsə mənsub olmuşdur, yəni o zaman doğrudan da müəyyən inzibati sahəni idarə edən şəxsə həm hakim, həm də daruğə deyilmişdir. Məsələn, Uzun Həsənin nəvəsi Əlvənd 1481-ci ildə vəfat etdikdən sonra əmirlərin bir neçəsi Yaqub Ağqoyunlunun sarayına məktub yollayıb daruğə göndərilməsini xahiş etmişlər. Aydındır ki, əmirlərin xahişi onlara hakim göndərilməsindən ötrü nəzərə çatdırılmış və burada daruğə hakim sözünün sinonimi kimi işlənmişdir.

«Tarixi-qızılbaşan» kitabındakı bir məlumat da «daruğə» və «hakim» istilahlarını eyniləşdirir. Anonim müəllifin bu kitabında oxuyuruq: «Həsən bəy (Uzun Həsən – Ş.F.) həmin qışda Muğanda qışladı və bütün İraq və Azərbaycana daruğələr yolladı».[108] Bu misaldakı «daruğə», heç şübhə yoxdur ki, hakimdir.

«Daruğə» istilahı hakim mənasında işləndikdə hakimin rütbəsi, yəni onun hakimliyi (əmarət) dərhal nəzəri cəlb edir. Bunun əksinə olaraq «daruğə» istilahı dar mənada işlənərkən bu daruğəliyin əmirlik olmadığı aydınlaşır. Məsələn, 1499-cu ildə Sultan Murad və Məhəmmədi Mirzə Ağqoyunlular döyüşərkən, birinci tərəfin dövlət bayrağı yerə düşmüşdü. Həsən bəy Rumlu göstərir ki, Pəhlivan Şahi adlı bir döyüşçü cəld həmin bayrağı qaldıraraq, geri qaçmaqda olan Sultan

---

[107] Kitabi-Diyarbəkəriyyə, səh.274-275.
[108] Tarixi-qızılbaşan, Tehran, h.1361 (m.1982), səh.15.



Murad döyüşçülərini qaytardı və onlar yenidən gəlib həmin bayrağın altında toplaşdılar. Döyüş qələbə ilə bitdikdən sonra Sultan Murad döyüşçüləri ruhlandıran Pəhlivan Şahiyə kəndinin darugəlıyını verir. Camaat ondan nə üçün Sultan Muraddan əmirlik istəmədiyini soruşduqda o, cavab vermişdi: «Atam o kəndin əkinçisi idi, mən isə daruğəsi olmuşam».[109] Hakim və daruğə vəzifələrinin eyni olmadığını göstərən başqa bir misal: 1500-cü ildə Bakı qalasının hakimi şahzadə Qazi bəyin arvadı, daruğəsi isə Əbülfəttah bəy idi.[110] Hakimlərin öz idarə aparatı – sədri, vəkili, vəziri və qoşunu olmuşdur.[111]

**Möhrdar :** Görkəmli saray nümayəndələrindən biri olan möhrdarın da fəaliyyəti saray aparatının təkmilləşdirilməsinə komək etmişdir. Möhrdar şahın xüsusi mohrünü qoruyan şəxsə deyilirdi. Onun sənədlərə vurduğu möhür şahın imzası demək idi. Zərurət olduqda möhrdar hərbi səfərlərdə də iştirak edir, şəxsən döyüşürdü.[112] «Kitabi-Diyarbəkriyyə»də biz ğir neçə Qaraqoyunlu və Ağqoyunlu möhdarının adlarına təsadüf etdik.[113] Lakin, təəssüf ki, bu müəllif möhrdar vəzifəsinin mahiyyəti barədə heç nə demir. Onun möhrdarı həmişə döyüşlərdə təsvir edilir. Məsələn, «Şeyx Əli Möhrdar... arxadan bir qılınc zərbəsi endirdi ..., atdan düşdü... o, yaralı idi».[114] Yaxud, «Şeyx Əli Möhrdar əksər döyüşlərdə olduğu kimi bu döyüşdə də mərdlik və cəsarət nümunəsi göstərib yeddi dəfə düşmənə qalib gəldi».[115] Həsən bəy Rumlu möhrdarın möhürünü «böyük möhür» adlandırır.[116]

---

[109] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə...,səh.57.
[110] Yenə orada.
[111] Yenə orada. Daruğə istilahı burada ətraflı məlumat üçün bax:Şahin Fazil. «Daruğə» istilahının məna dəyişkənliyi, Xorasan c-lı №5, Kabul, h.1360/m.1982 (fars dilində).
[112] Yenə orada, səh.63.
[113] Kitabi-Diyarbəkriyyə, səh.111-112, 115, 123,140...
[114] Yenə orada. səh.123.
[115] Yenə orada. səh.140.
[116] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə,səh.63.

Yuxarıda nəzərə çatdırıldığı kimi, bu mülki-inzibati vəzifələrin XV əsr Azərbaycan feodal dövlətlərinin quruluşunda əhəmiyyətli rolu olmuşdur. Sarayda, dövlət idarələrində və başqa yerlərdə fəaliyyət göstərən aşağıdakı vəzifələr də məlumdur:

Mustovfi (maliyyə işlərinə baxan məmur), münşiyəl-məmalik, eşikağası, qapıçı, pərvanəçi (rəsmi məktub və fərmanları yazan katib), xəzinədar, mehmandar, çaşniqər yaxud bekavul (aşxana rəisi), quşçu (şahın ov quşlarına nəzarət edən məmur), məşəldar, şirəçi yaxud ayaqçı (saray üçün şərab və şərbət tədarük olunmasında məsul şəxs), fərraş (saray və mülkü idarələrdə xidmətçi), kitabxana qulluqçuları, cərrah, süfrəçi və s.). Yuxarıdakı bəzi vəzifə sahiblərinin bir neçəsi barədə müxtəsər məlumat vermək mümkündür.

**Pərvanəçi:** Sarayın rəsmi sənədlərini qələmə alan hörmətli katiblər pərvanəçi adlanmışlar. Vəzifəsinin müəyyən mənadə mirzəçilik olmasına baxmayaraq, pərvanəçiyə hərbi tapşırıqlar da həvalə olunur, ona diplomatik missiyanın yerinə yetirilməsi tapşırılır, hətta döyüşlərdə iştirak etmək də həvalə olunurdu. Ə.Tehrani yazır ki, Cahanşah Qaraqoyunlu Şiraza hakim təyin etdiyi oğlu Pirbudağı dikbaşlığına görə cəzalandırmaq üçün Şiraza yollananda şəhərin ən mühüm giriş qapısının (darvaza) mühafizəsi şahzadə tərəfindən İbrahim bəy Pərvanəçiyə tapşırılmışdı, lakin, «pərvanəçi peşmanlıq yoluna qədəm qoyub qaçdı və ona tapşırılan darvazanı buraxıb Cahanşahın düşərgəsinə gəldi... Onun qaçmağı Pirbudağın süqutunu yaxınlaşdırdı və Cahanşahın adamlarında Şirazın fəth olunacağına ümid yaratdı».[117] Sultan Xəlil Ağqoyunlunun bir neçə aylıq hakimiyyəti zamanı (1478) Əmir Cəlaləddin Qutlu bəy və Cəlaləddin Həsənəli bəy onun pərvanəçiləri idilər.[118]

Pərvanəçi son dərəcə etibarlı şəxslər arasından seçilir və ona bəzən sultanın maliyyə işləri də tapşırılırdı, qızıl etibar olunurdu. Fəzullah Ruzbehan yazır ki, Yaqub Ağqoyunlu

---

[117] Kitabi-Diyarbəkriyyə, səh.195.
[118] S.Onullahi. Göst.məq. səh.44.



hakimiyyəti qardaşı Sultan Xəlildən almaqdan ötrü Təbriz üzərinə yürüşə başlayanda bir müddət Ərciş çayı kənarında dayandı. «Orada ona təzim etmək üçün çoxlu əmir və əyanlar gəldilər. Çoxlu pul paylandı ki, bu işi qoltuğunda qızıl kisələri tutmuş pərvanəçi icra edirdi».[119]

**Mustovfi:** Qaraqoyunlu və Ağqoyunlu divanlarında maliyyə işlərinə mustovfilər rəhbərlik edirdilər. Sədr Qazi İsa Savəcinin babası Şükrulla Uzun Həsənin hakimiyyəti dövründə şahın maliyyə vəkili, yəni mustovfisi olmuşdu.[120] Qardaşı Sultan Xəlildən sonra Ağqoyunlu taxtında əyləşən Yaqub tərəfindən dərhal «şah fərmanı» verilir və fərmanda vergilərin (xariciyyati-məmalik) ixtisarı (təxfif) öz əksini tapır. F.Xunci yazır ki, divan mustovfiləri tərəfindən həmin vergilərdən yığılan gəlir müəyyən edildi və onun ümumi məbləği 70.000 tümən oldu və bu məbləğ dərhal ləğv edildi.[121]

**Münşiəl-məmalik:** V.F.Minorskiyə görə, münşiəl-məmalik xarici işlər veziri kimi bir vəzifənin sahibi olmuşdur. Eyni zamanda o dövlətin müxtəlif məsələlərinə dair məktubların hazırlanması və göndərilməsi işi ilə də məşqul olurdu. Bu vəzifə dövlət və ölkənin mühüm sahəsindən biri idi.[122]

Bir çox tarixi salnamələrdə şah və iri feodalların xidmətçiləri olan bu kimi vəzifə sahibləri barədə çoxlu qeydlər mövcuddursa da, təəssüf ki, mənbələr onların ehtiva etdiyi məzmun barədə məlumatlardan xalidir. Yəni dövrün elə məlumat kitabı yoxdur ki, onda Qaraqoyunlu, Ağqoyunlu və Şirvan dövlətlərinin quruluşunda mühüm rolu olan vəzifələrin əksəriyyəti barədə konkret bir fikir əks edilmiş olsun. Amma, bunun əksinə olaraq mənbə və ədəbiyyatda həmin vəzifə sahiblərinin demək olar ki, hamısının hərbi səfərlərdə şahla birlikdə olması, hətta onlarla döyüşdə iştirakı barədə qeydlər

---

[119] Fəzullah Xunci, göst.əsər, səh.52.
[120] Yenə orada.
[121] Fəzullah Xunci, göst.əsər, səh.58.
[122] S.Onullahi. Göst.məq. səh.44.

vardır. Məsələn, «...Əli bəy (Uzun Həsənin atası – Ş.F.) mərdlik göstərdi. Onunla birlikdə olan Məhəmməd Xəzinədar, Məhəmməd Bukavul döyüşdə çox böyük səy göstərdilər.[123] Yaxud, «Böyük döyüş oldu... Qazinin oğlu Əli Şirəçi elə şücaətlər göstərdi ki, dövranın adlı-sanlı adamları ona heyran qaldılar».[124]

Qeyd etmək lazımdır ki, Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin quruluşunda mühüm rolu olan simalar barədə mənbələrdə və eləcə də ədəbiyyatda məlumatın nisbətən çox olmasına baxmayaraq, Şirvana aid məxəzlərdə elə məlumat, demək olar ki, yox dərəcəsindədir. Akad.B.Dorn 1861-ci ildə Qafqaza səyahət zamanı Salyanda «nahiyyə məşvərətçisi Mehdi bəyin köməyi ilə Şirvanşah Fərrux Yasarın 1474-cü il tarixli bir fərmanının surətini çıxarmışdı. Şirvanın dövlət idarə usulu, əhalinin müxtəlif təbəqələri, rəiyyətin vəziyyəti, bir sıra vergilər və inzibati məsələlər haqqında məlumat verən bu sənəddə Şirvan tarixinin bir sıra işıqlandırılmamış məsələləri əks olunmuşdur. Sənədin tərtib edildiyi tarix Şirvan dövlətinin sosial-siyasi və mədəni cəhətdən inkişaf etmiş bir dövrünə təsadüf edir. O zaman Yaxın Şərgin zəngin dövlətlərindən biri sayılan Şirvanın bir sıra şəhərləri Avropa ilə Şərq ölkələrini birləşdirən karvan-ticarət yollarının əsas düyünlərində yerləşdiyi üçün ölkə tranzit ticarətində də mühüm rol oynayırdı».[125]

Sənəddən müəyyən edildiyinə görə Şirvanşah Fərrux Yəsar Şirvan dövlətinə tabe olan Gəştasfi və Salyan vəlayətlərinin, eləcə də Mahmudabad şəhərinin idarəsini böyük oğlu Şamxal Sultan Məhəmməd Qazi bəyə tapşırır və onun həmin yerləri necə idarə edicəyini müəyyənləşdirir: müəyyən vəzifə sahiblərinin rütbəsini yüksəltmək, alçaltmaq, müqavilə bağlamaq, müqavilələri ləğv etmək Məhəmməd

[123] Kitabi-Diyarbəkriyyə, səh.67.

[124] Yenə orada, səh.138.

[125] Сборник статей по истории Азербайджана. Стр.210; С.Ашурбейли. Очерки истории средневекового Баку, Bakı,1964, səh.91; M.X.Nemətova XV əsr Şirvan tarixinə dair qiymətli sənəd, Azərb.SSR EA «Xəbərlər»i, Tarix, fəlsəfə və hüqüq seriyası,1966,№4, səh.63.



Qazi bəyin hökmranlıq (hakimlik) səlahiyyətinə daxil edilir. Əhalinin mülki, şəri məsələlərini ruhani alimlər və axundlarla müzakirə etmək, onların fikri ilə razılaşmaq şahzadəyə xüsusi tapşırılır və məsləhət görülürdü.

Məhəmməd Qazi bəyə tapşırılırdı ki, «islam dininin qayda-qanununa əməl etsin, əzəmətli seyidlərə, görkəmli şeyxlərə, imamlara hörmət bəsləsin, onlardan vergi toplanmasına yol verməsin». Sənəddə seyidlər, şeyxlər ölkədə, hətta dünyada nizam-intizamın dayağı kimi qeyd edilmişdir. Beləliklə bir daha məlum olur ki, bütün müsəlman Şərq dövlətlərində olduğu kimi Şirvanşahlar dövlətində də din əhlinə böyük intiyazlar verilmiş, onlar feodal Azərbaycan dövlətlərinin dayağı olmuşlar.

Şirvanşah Fərrux Yəsar oğlundan tələb edirdi ki, yüksək rütbəli dövlət məmurlarına divan üçün vəsait toplayarkən ədalətsizliyə yol verməmələri üçün onların üzərində nəzarət etsin. Həddindən artıq soyğunçuluğa yol verməsinlər, elə etməsinlər ki, əhali dağılıb qaçsın. Günahkarları cərimə edərkən dəftərlərdə qeyd olunmuş qayda-qanunlardan kənara çıxmasınlar. Bu sənədə görə Şirvanda möhkəm bürokratik dövlət aparatının və ciddi dövlət qanunlarına əsaslanan üsuli-idarə olmasını güman etmək olar.[126]

## *2. Hərbi quruluş və məhkəmə sistemi*

XV əsr Azərbaycan feodal dövlətlərinin quruluşu haqqında əlahiddə bir mənbə olmadığı kimi, bu dövlətlərin hərbi təşkilatları və məhkəmə sistemi barədə də xüsusi əsər yoxdur.

Bir qayda olaraq, döyüşə gedən ordunun başında hökmdarın özü dururdu. Qaraqoyunlulardan Qara Yusifin, Qara İsgəndərin, Cahanşahın, Ağqoyunlulardan Uzun Həsənin, Sultan Yaqubun, Rüstəm padşahın, Şirvanşahlardan I İbrahimin, Xəlilullahın, Fərrux Yəsarın döyüş şücaətləri

[126] Bu haqda məlumat üçün M.X.Nemətovanın məqaləsinə bax

barədə mənbələrdə məlumat boldur. Onlardan əvvəlki hökmdarlar da şəxsən döyüş meydanlarına gedir, özlərinin sərkərdəlik və döyüşçülük məharətlərini nümayiş etdirirdilər. Məsələn, səlcuq, monqol, teymuri hökmdarları şəxsən böyük əzmlə vuruşur, vəzir əmir və döyüşçülərə bir növ nümunə olur, hər qələbəni qılınc gücünə şəxsən əldə edərdilər. Əmir Teymur yazır: "Başıma polad dəbilqə, əynimə Davudi savut (hərbi süvari libas) geyindim, belimə misri qılınc bağladım, bahadırlıq və güləş taxtına əyləşdim. Turanlı divürəklilərin, Xorasan pəhləvanlarının, Gilan və Mazandaran batırlarının ürəklərinə səksəkə saldım və Sivas, eləcə də Gürcüstan qalalarını fəth elədim. Qalada dikbaşlıq eləyənlərin hamısını dəmirlə dağladım, qaladan ələ keçirdiyim bac-xəracı qalib əsgərlərimə payladım. Azərbaycandakı pozğun, başsız adamları tənbeh elədim. (Sultan Əhməd Cəlairi və Qara Yusif Qaraqoyunluları nəzərdə tutur - Ş.F.)... 27 padşahın taxtını ələ keçirdim. İrana, Turana, Ruma, Məğribə, Şama, Misrə, Ərəb İraqına, Əcəm İraqına, Mazandarana, Gilana, Şirvana, Azərbaycana, Farsa, Xorasana, Dəşti-Ceteyə, Dəşti-Qıpçağa, Xarəzmə, Xütənə, Babilistana, Baxtərzəminə, Hindistana padşah və hökmdar oldum... On iki yaşımdan dürlü-dürlü diyarları gəzdim. Əzab-əziyyət gördüm. Hər cürə tədbirə əl atdım, qoşunlar sındırdım, əmirlərdən və adi qulluqçulardan acı sözlər eşitdim, pisliklər gördüm, lakin eşitdiyimi eşitməzliyə, gördüyümü görməzliyə vurdum. Qılıncımı qından çıxarıb döyüşə girdim. dürlü-dürlü məmləkətləri, vilayətləri ələ gətirdim. Dünyada ad çıxartdım."(Bax: "Əmir Teymurun vəsiyyətləri." səh47-48)

Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində ordunun ən yuxarı zümrəsini şahla bir tayfadan olan əmirlər təşkil edirdi. Məsələn Qaraqoyunlularda – barani, Ağqoyunlularda isə bayandurilər yüksək toxunulmazlıq hüququna və müstəsna səlahiyyətlərə malik idilər. Ağqoyunlularda bayanduri bəylərinə «boy bəyləri», əskərlərinə isə «boy nökərləri» deyirdilər.[127] Şirvanşahlarda isə ordu müharibə gözlənilən

[127] İslam ensiklopediyası, I cild, səh.266.



təqdirdə yerli rəiyyət və tayfalardan yığılan adamlardan təşkil olunurdu.

Azərbaycan dövlətlərinin ordusu sarayın ixtiyarındakı nisbətən azsaylı qoşundan və ayrı-ayrı vilayətlərdə yaşayıb, yalnız hərbi yürüşlər zamanı cəmlənərək öz başçıları (sərdar) ilə birlikdə hökmdarın köməyinə yollanan döyüşçülərdən (çərik) ibarət olmuşdur. Piyada qoşun dəstələrinin təşkilinə isə ilk dəfə Qara Yusifin teymuri Şahruxla döyüşə yollanması zamanı təsadüf olunur.[128]

Qeyd olunduğu kimi, ordunun böyük hissəsi çəriklərdən ibarət idi ki, onlara əsasən gəldikləri yerlərin tayfa başçıları rəhbərlik edirdi. «Xassə əskərlər» deyilən döyüşçü dəstələrinə (şahın tabeliyindəki əskərlərə) illik maaş verildiyi halda, çəriklərə yalnız onlar döyüşə çağırıldıqdan sonra pul ödənilirdi.[129]

Ağqoyunlu qoşununda hökmdarın təminatında olub, müəyyən imtiyazlara malik qvardiya hissələri, boy və xassə nökərləri vardı. Onlar əsasən Ağqoyunlu tayfalarından olan və hakimiyyət başında duran bayandurilərə mənsub idilər. Qoşunun ali rəisləri «əmir» adlanırdı, kiçik başçılara isə «qibtəul» deyirdilər. Hər iki vəzifə əyanlara mənsub idi və bu vəzifələrə tayfa başçıları təyin olunurdu.

Qoşun puşandarlardan (ağır silahlı süvarilərdən) və tirkəşbəndlərdən (oxatanlardan) ibarət idi.

Əsasən yarımköçərilərdən ibarət olan döyüşçüləri, adətən, onların ailələri, qulları və xidmətçiləri müşayiət edirdilər. Buna görə də qoşun təşkilatının köçəri ənənələrlə sıx surətdə bağlı olduğu aydınlaşır. Qoşun səfərdə olduğu zaman (ilin fəsillərindən asılı olaraq) qışlaq və yaylaq yerlərində dayanırdı.

Qoşunların miqdarı haqqında dəqiq məlumat yoxdur. Qaraqoyunlu qoşununda təxminən 50 min nəfər,

[128] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.68,94.
[129] İslam ensiklopediyası, I cild, səh.26 6.

Ağqoyunlularda isə 100 min nəfər döyüşçü olduğunu etimal etmək olar.[130]

Osmanlı hökmdarı II Sultan Məhəmməd Fatehlə döyüş ərəfəsində Uzun Həsən onun dövlətinə səfir kimi gələn Venesiya diplomatı Katerino Zenonu Ağqoyunlu ordusuna dəvət etmişdi ki, baxış qurtardıqdan sonra K.Zeno tərəfindən Venesiyaya göndərilən məktubda senata yazılırdı: «Onların sayı 100 min nəfərdir… Suvarilər və onların atları italyan tərzində silahlanmışlar. Bəzi döyüşçülər bədənlərini hər hansı bir ağır zərbədən qorumaqdan ötrü sinələrini möhkəm dərilərlə örtmüşdülər… Bu suvarilərin qulluqçuları da yaxşı atlara minmişlər… Döyüşçülər 40 min nəfər, onların qulluqçuları isə təxminən 60 min nəfər idi… Şahın cavan oğlanları da onunla idilər»[131]

Ağqoyunluların 1473-cu ildə baş vermiş Otluqbeli məğlubiyyətindən sonra Uzun Həsən dövlətdə mərkəzləşmə ənənəsini həyata keçirməyə başladığından bəzi yüksək rütbəli əmirlər və hətta şahzadələr də ona qarşı düşmən mövqe tutmuşdular. Buna misal olaraq Uğurlu Məhəmmədin atası əleyhinə qiyamını göstərmək olar. Bundan xəbər tutan Ağqoyunlu hökmdarı dərhal oğlunu cəzalandırmaq niyyətinə düşərək hucum etmək üçün qoşun toplayır və həmin qoşunun miqdarı barədə başqa bir venesiyalı diplomatın – Cozafa Barbaronun məlumatı müfəssəldir. C.Barbaro yazır : «Şahı şəxsən ləyaqətli adamlar müşayiət edir və xidmətində dururlar… Bu arada əskər və heyvanların miqdarını saymağa başladılar. Amma bizdə olan qayda-qanunun əksinə olaraq, adamların sayını səbt etmək və atları dağlamaqla məşqul olmadılar. Onlar yalnız qoşun başçılarını yanlarına çağırır, ixtiyarlarındakı döyüşçülərin sayının düzgün olub-olmadığını soruşurlar… Mən öz xidmətçimlə onların arasından keçdim və paxla hesabı ilə ləşkəri saymağa girişdim. Hər 50 nəfəri saydıqdan sonra cibimə bir paxla salırdım. Baxış sona çatdıqda

[130] Azərbaycan tarixi, «Elm» nəşr. III cild, səh.105-106.
[131] Səfərnamehayi-venizyan dər İran, Tehran, h.1349, səh.217-218 (fars dilində).



hesablayıb əskər və heyvanların sayını aşağıdakı kimi müəyyən etdim:

Çadırların sayı – 6000 (altı min);
Dəvələrin sayı - 30000 (otuz min);
Qatırların sayı – 5000 (beş min);
Yabıların sayı – 5000 (beş min);
Ulaqların sayı – 2000 (iki min);
Xidmət atlarının sayı – 20000 (iyirmi min);

Süvari atların sayı iki min baş idi. Onların üstünə dəmir zireh (bərgostvan) və qızıl-gümüşdən düzəldilmiş dördkünc zirehlər salınmış və atlar xırda zəncirlərlə bir-birinə bağlanmışdılar. Zirehlərin ətəkləri yerədək sallanırdı. Bəzi atlar, bizdə olduğu kimi, dəri ilə örtülmüşdü… Sonra aşağıdakıları saydım:

2 min baş gözəl qatır, 20 min baş xırda buynuzlu heyvan, 2 min baş iri buynuzlu mal-qara, cəmisi 100 dənə ov yüzpələngi (?), 200 dənə dişi və başqa şahin quşu, 3 min ədəd tazı, 1000 ədəd ov iti, 50 ədəd qırğı, 15 min nəfər beli qılınclı döyüşçü, 2 min nəfər silahlı qulamlar, çobanlar və başqa xidmətçilər, 1000 nəfər oxatan. Bunlardan başqa 25 min seçkin suvari, 3 min nizəsi və oxu olan piyada əskər, ali və orta təbəqədən olan 10 min qadın, 5 min xidmətçi qadın, 15 yaşından 6 yaşınadək 6 min kiçik qız və oğlan uşağı, təxminən beş yaşlı 5 min başqa uşaqlar.

Suvarilərin 1000 nəfəri nizəatan, 5 min nəfəri qalxanaparan, təxminən 10 min nəfəri oxçu olmaqla yerdə qalanlarının müxtəlif silahları vardı. Əskərlərin yan-yörələrində görünən və öz mallarını satan sənətkarlar aşağıdakılardan ibarətdir: Ordunun bütün ehtiyacını ödəyən dərzilər, çəkməçilər, dəmirçilər, yəhərçilər və oxdüzəldənlər. Sonra, hər yerdə səliqə-sahmanla çörək, ət, meyvə, şərab və başqa şeylər satan adamları da gərək sizə xatırladam. Orduda ədviyyə satan əttarlar da vardı».[132]

Başqa bir Venesiya diplomatı Ambrozio Kontarini isə səfirlərə nümayiş etdirməkdən ötrü hazırlanan Ağqoyunlu

[132] Səfərnamehayi-venizyan …, səh.73-74.

piyada və süvari qoşunlarının rəsmi-keçidi barədə məlumat verib yazır: «Müxtəlif adamlardan və Cozafa Barbarodan əlahəzrətin xidmətində olan nizami süvarilərin miqdarı haqqında soruşduqda məlum oldu ki, 25 min nəfərdən çox deyillər».[133] A.Kontariniyə görə, belə rəsmi-keçidin hazırlanmasından məqsəd «gördüklərimiz barədə qayıdıb öz hökmdarımıza məlumat vermək idi».[134] Diplomat sonra Ağqoyunlu ordusunun silahları barədə yazır: «Onların silahları ox, kaman, qılınc və qalxandan ibarətdir... Nizədən istifadə etmirlər».[135]

Dövrün mənbələrində ordunu təşkil edən hissələr «qoşun, ləşkər» əskərlər isə «dilavər, əskər, mülazim, nökər və qulluqçu» adlanır. Ordu cəngə başlamazdan əvvəl döyüşün olacağı meydana «çərxçi» yaxud «çərxəçi» adlanan dəstə çıxarılırdı və bu dəstəyə rəhbərlik «çərxçibaşı» tərəfindən həyata keçirilirdi.

Dilçi alim H.H.Zərinəzadəyə görə çərxçilər «çərx» (?) adlı «maşınlarla» təchiz edilir və mühasirəyə aldıqları şəhərə çərxlərdən od yağdırarmışlar.[136] Bu qəribə məlumatın H.H.Zərinəzadə tərəfindən hansı mənbədən götürüldüyü məlum deyildir, lakin bizə məlumdur ki, çərxçi dəstələrinin əsas fəaliyyətləri mühasirə zamanı yox, hucum vaxtı, özü də şəhər ətrafında yox, döyüş meydanında olmuşdur. Çərxçilərin döyüş meydanına çıxarılması döyüşün başlanması demək idi.Sübut üçün bircə fakta müraciət etmək kifayətdir: «Elə ki çərxçilər hər iki tərəfdən meydana gəldilər, döyüş başlandı».[137]

Çərxçi dəstələrinin mövcudluğu faktına biz XV əsrin II yarısında təsadüf edirik, XVI əsrdə isə həmin dəstələrin fəaliyyəti daha mütəşəkkil olur və onlar ordunun avanqard hissəsini təşkil edirdilər. Çərxiçilərin döyüşə ilk atılan hərbi

---

[133] Səfərnamehayi-venizyan ..., səh.146-147.
[134] Yenə orada, səh.147
[135] Yenə orada.
[136] H.H.Zərinəzadə. Fars dilində Azərbaycan sözləri, Bakı, 1962, səh.278.
[137] Aləmarayi-Səfəvi, Tehran, h.1350, səh.81.



dəstə olduğunu tədqiqatçılardan Ə.Ə.Dehxoda[138] və Ə.Müntəzirsahib[139] də qeyd etmişlər.

Güman ki, çərxçi dəstəsinə kimin rəhbərlik edəcəyi döyüşə yollanma ərəfəsində müəyyən edilmişdir. Məsələn, «Aləmarayi-Səfəvi» adlı mənbədə məşhur Ağqoyunlu əmiri Eybə Sultanın bir fəaliyyəti barədə oxuyuruq: «Eybə Sultan beş min nəfərlə çərxçi olub...».[140]

«Tarixi-aləmarayi-Əmini» əsərində isə çərxçilərin silahlarının tüfəngdən ibarət olmağı aydınlaşır. Fəzlullah Xunci yazır: «Sultan Xəlil döyüşə başladı. O, münqəlayı Şərəfəddin Osman Miranşahiyə, Şeyx Əli Pornaka və Xəlil bəy Sufiyə (Sufi Xəlilə – Ş.F.) tapşırdı. Əvvəlcə çərxçilər hucuma keçdilər və Yaqubun çərxçiləri Xəlilin topuna qədər gedib çıxdılar, amma Xəlil qoşununun mərkəzi hissəsini (qəlb) top və tüfənglərlə möhkəmləndirdiyindən topçular çərxçiləri öz atəşləri ilə pərən-pərən saldılar».[141]

Cəng başlanarkən kimlərin çərxçi təyin edilməsi məsələsi, görünür ki, çox əhəmiyyətli olmuşdur. I Şah İsmayıl Səfəvi və Ağqoyunlu Əlvənd arasında həlledici döyüş başlanmazdan əvvəl, Səfəvi hökmdarı tərəfindən döyüşə göndərilən Qara Piri Qacar vəziyyətin qorxulu olduğunu nəzərdə tutub çərxçiliyi öz üzərinə götürmüş və əmir İlyas bəy Halvaçıoğluya demişdi: «Sən bayrağın yanında mənim yerimdə dayan ki, mən özüm çərxçi olum. Bu bizim türkmanlarla (Ağqoyunlularla – Ş.F.) ilk döyüşümüz olduğundan, başqa heç bir kəsə gümanım yoxdur ki, onu çərxçi edim».[142]

«Aləmarayi-Səfəvi» əsərində çərxçilik (çərxçigəri) vəzifəsinin məzmunu barədə maraqlı bir fakt da vardır. Orada göstərilir ki, Rum sultanından (osmanlı sultanından – Ş.F.) top və əskəri quvvə ilə kömək alan Sultan Murad Ağqoyunlu qızılbaşlarla qarşı çıxır. Şah İsmayıl vəziyyəti belə görüb öz

---

[138] Lüğətnamə №50, səh.156.
[139] Aləmarayi-Şah İsmayıl, Tehran, h.1349, səh.76.
[140] Aləmarayi-Səfəvi, səh.59.
[141] F.Xunci. Göst.əsər, səh.53-54.
[142] Aləmarayi-Səfəvi, səh.89.

adamları ilə məsləhətləşdikdən sonra onlara deyir:» «Elə bir adam istəyirəm ki, rum qoşununun həşəmətindən qorxmasın və bizim pişxanəmizi (qoşunun daşıdığı cəng vəsaiti – Ş.F.) rum qoşununun iki fərsəxliyinə aparıb yerləşdirsin». İlyas bəy Halvaçıoğlu ona cavab verir: «Mən zəfərli qızılbaş qoşunun çərxçisi olduğum üçün bu, mənim işimdir».[143] Deməli, çərxçinin fəaliyyəti dairəsinə döyüş sürsatının daşınması və yerləşdirilməsi də daxil idi.

Qeyd etməliyik ki, çərxçi və çərxçibaşı məfhumları hələ tamamilə açılmadı və gələcəkdə bu məsələ üzərində araşdırma aparılmalıdır. Çərxçi ilə yanaşı başqa bir istilah – «muçi» istilahı da diqqəti cəlb edən orta əsr istilahlarındandır. Biz vaxtı ilə «muçi» istilahı ilə məşqul olaraq onun səfəvilər dövründə yarandığını ehtimal etmiş və XV əsr hadisələrinin təsvirində muçi dəstələri haqqında məlumata təsadüf etmədiyimizi yazmışdıq.[144] O vaxt bu doğrudan da belə idi və bizim əlimizdə Fəzullah Xuncinin «Tarixi-aləmarayi-Əmini» kimi qiymətli mənbəi yox idi. Bu məsələ ilə əlaqədar indi isə F.Xuncinin mənbəinə müraciət edək: Ağqoyunlu taxt-tacına sahiblik uğrunda iki qardaş – Sultan Xəlil və Yaqubla ölüm-dirim mübarizəsi getdiyi zaman, yuxarıda yazıldığı kimi, artıq tərəflər üz-üzə gəlmişdilər. Mənbədə oxuyuruq: «Xəlil qoşununun münqəlay hissəsinin adlı-sanlı rəhbərləri də çərxçilərin dəf olunmalarında iştirak edirdilər. Onlar çərxçiləri muçi əmirlərinə tərəf – Həsənəli ibn Şeyx Əli Möhrdara, Hüseyn bəy Qaramaniyə, Seydi Əhməd bəy Pornaka və Şahməhəmməd bəy Duxarluya tərəf sıxışdırdılar. Xəlilin münqəlayındakı əmirlər muçi əmirlərindən iki dəfə güclü olduqlarından onlar muçi əmirlərini geriyə qaytardılar».[145] Deməli, Ağqoyunlu qoşununda «muçi əmirləri» adlanan xüsusi dəstə də mövcud olmuşdur. Ç.N.Seddon «muçi» sözünün heç bir lüğətdə olmadığını yazır.[146] Doğrudan da onun

[143] Yenə orada, səh.78.
[144] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə...,səh.72.
[145] F.Xunci. Göst. əsər, səh.54.
[146] Əhsənüt-təvarix, Baroda, səh.12.



lüğəvi mənası aydınlaşmamışdır, lakin V.F.Minorski fars dilindən rus dilinə çevirdiyi «Tarixi-aləmarayi-Əmini» əsərinin «Qeydlər» hissəsində yazır: «Muçi istilahı Həsən Rumulun «Əhsənüt-təvarix»ində vardır. Çaldıran döyüşü zamanı fars hərbi sərkərdəsi Saru Pirə (Saru = Sarı Pirə, adından da göründüyü kimi, fars əmiri deyil, türk əmiri olmuşdur - Ş.F.) çərxçi alayı ilə osmanlı münqəlayına hücum edərək onu olduğu yerdən geriyə, muçilərə tərəf atdı, amma elə o vaxt muçilərin rəisi Saru Pirənin ardınca hücuma keçdi»[147]. V.F.Minorski bu istilahın mənası ilə əlaqədar sözünə davam edib yazır: «Əsərin 404-cü səhifəsində yenə də həmin müəllif (Həsən Rumlu – Ş.F.) döyüşə muçi və çərxçilərsiz getməyə ürək edən fars əmirlərinin (türk qızılbaş əmirlərinin – Ş.F.) özbəklərlə məğlubiyyətini təsvir edir».[148]

Bu məşhur rus şərqşunasının fikrincə «çərxçi» ilk təşəbbüs göstərən, ilk başlayan anlamını verir, «muçi» isə güman ki, münqəlayın arxasındakı ehtiyat əsgərlərinə verilən ad olmuşdur.[149]

Ordunun hərbi quruluşu ilə əlaqədar «qulluqçu» istilahı da diqqəti cəlb edir. Müasir azərbaycan dilində də işlənən bu söz təxminən orta əsrlərdə, o cümlədən XV əsrdə işlənən «qulluqçu»nun daşıdığı mənanı bildirir. Lakin, göstərmək lazımdır ki, qulluqçular o zaman hərbi dəstələrdə xidmət edir, istilahın məzmununa müvafiq olaraq at, dəvə və başqa heyvanlara qulluq edirdilər.[150] V.F.Minorski qulluqçuların süvari və ya piyada olduqlarının müəyyənləşmədiyini yazır,[151] italyan diplomatı Katerino Zeno isə qulluqçuların süvari olduqlarını nəzərə çatdırır: «Bu süvarilərin nökər və qulluqçuları da yaxşı atlara minirlər və dəmirdən tökülmüş

[147] F.Xunci. Göst. əsər, səh.128.
[148] Yenə orada.
[149] Yenə orada.
[150] Сборник статей по истории Азербайджана...., səh.79.
[151] Minorsky V. A Civil and Military Review in Fars in 881/1476, B SOS, vol X p.1,1940,s.164.

zirehli libas geyinirlər».[152] Müharibənin gərgin vaxtlarında qulluqçular da döyüşə çıxarılırdılar.

Qeyd etməliyik ki, bəhs etdiyimiz dövrdə döyüşçülərə məvacib «divani-ləşkər» («qoşun divanı») adlanan maliyyə divanı tərəfindən ödənilirdi. Ordu ayrı-ayrı dəstələrə bölünmüşdu. Silahlar arasında qılınc, xəncər, ox, tüfəng (az miqdarda – Ş.F.), balta, gürz və qaladağından silahlar – rəadə, mancanaq da vardı. Ağqoyunlu ordusu əsrin sonuna yaxın az da olsa toplar və tüfənglərlə silahlanmışdı. Silahlar «qurxanə» adlanan silah ambarında saxlanılır, qurxanənin fəaliyyətinə xüsusi cəbbədarlar rəhbərlik edirdilər. Həsən bəy Rumlu yazır ki, Qara Yusif və Cahanşah Qaraqoyunlu döyüşçülərinin əksəriyyəti zirehli (cövşənpuş) idilər. Kəcim adlanan örtük də döyüş libasları sırasına daxil idi.[153] Cəngə surən (əskərlərin nərəsi), nəfir, şeypur, nağara, gəbrəgə (böyük nağara) təbil və bayraqla yollanırdılar. Hücum zamanı kərənay (uzun zurna), qələbə əldə ediləndə isə nağara səsləndirilirdi. Döyüşün gedişatı vaxtı əskəri quvvələrin bir hissəsi ehtiyatda (tərh) durur, vuruşmanı müşahidə edir və lazım olduqda döyüş meydanına çıxarılırdılar.[154] Qoşunlar əskərlərinin mənsub olduqları yerin adı ilə adlandırılırdı: Qarabağ, Muğan, Şirvan qoşunu[155] və s.

Müharibə gözlənilən vaxt yerlərə istimalətnamə (cəlbedici məktub, nəvaziş məktubu) göndərilib ənam vəd edilir və beləliklə qoşun toplanışı surətləndirilirdi. Əskər yığımı «yasaq» adlanırdı. Vilayətlərdə yaşayan əmir və əyanlar fərman alan kimi öz çərikləri ilə padşaha köməyə gəlir, yalnız müharibə bitdikdən sonra öz yerlərinə geri qayıdırdılar.

Döyüş gözlənilən təqdirdə hökmdarlar arasında hərbi ittifaqın yaranması da vacib hərbi siyasət sayılırdı. 1414-cü ildə Şirvanşah I İbrahim Qaraqoyunlu Qara Yusiflə

[152] Səfərnamehayi-venizyan ... ,səh.216.
[153] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.68.
[154] Yenə orada.
[155] Yenə orada səh.68.



döyüşməkdən ötrü Şəki hakimi Şəmsəddin Əlinin oğlanları, habelə Gürcüstan valisi Kustandil (Konstantin) ilə ittifaqa girmişdi.

Müharibə baş tutmadıqda, yaxud dövlətlər arasında ümumi razılıq əldə ediləndə sülhnamə (sülh müqaviləsi) tərtib edilirdi. Məğlubiyyətə uğrayan tərəfin məşhur əsirlərinin qalib gələn tərəfə cəlb edilməsindən ötrü «nəvazişnamə» («nəvaziş məktubu») yazılırdı. Qələbə xəbərini qonşu dövlətlərə bildirməkdən ötrü «fəthnamə» («qələbə məktubu») yollanırdı. Çətinliklə ələ keçirilən şəhərin əhalisindən müqavimət göstərib orduya ziyan vurduqları üçün böyük məbləğdə təzminat alınırdı. Başqa dövlət başçıları qalib tərəfi qələbə münasibətilə təbrik edir (təhniyət), töhfə yollayırdılar.[156] Bəhs olunan dövrdə ordunun müxtəlif hissələri belə adlandırılmışdır:

Cəvanğar, yaxud meysərə (sol qol, yaxud sol cinah);

Bərənğar, yaxud meymənə (sağ qol, yaxud sağ cinah);

Qul (ordunun mərkəzi), yaxud qəlb;

Mənqəlay, yaxud pişdar (ordunun ön hissəsi). Mənqəlayın da cəvanğar və bərənğarı olurdu. Mənqəlayda minlərlə döyüşçü vuruşdu, çünki mənqəlay hucumunun döyüşün sonrakı gedişi üçün böyük əhəmiyyəti vardı.

XV əsr Azərbaycan feodal dövlətlərində bu hərbi istilahları əsasən özlərindən əvvəlki monqol və teymuri ordularından əxz etmişdilər. Bu baxımdan Əmir Teymurun kitabına bir daha müraciət etmək yerinə düşərdi:

"Əsl sərdar odur ki, qırx min atlı hərbçini on dörd bölüyə ayırıb düzə bilsin. Əvvəl özünə tabe olan cərgələri nizama düzüb onu "qol" adlandırsın. Sonra bərənğarın üç bölüyünü nizamlayıb onların birinə "bərənğar hiravulu" (sağ cinahın ön dəstəsi-Ş.F.) adını versin. Sonra cəvanqarın üç bölüyünü düzüb, onların birini "cəvanqar hiravulu" (sol cinahın ön dəstəsi - Ş.F.) adlandırsın. Bu tərz ilə bərənğar bölüklərinin yanına daha üç qoşun düzüb onlara "çapavul" adını qoysun,

[156] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.69-70; Yenə onun: Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə. Bakı, 1995. səh.49.

həmin üç bölükdən birini isə "çapavulun hiravulu" adlandırsın. Bu qayda ilə daha üç qoşunu nizamla düzüb, onları cəvanğarın alt hissəsində yerləşdirib, "şigavul" adını qoysun, həmin üç qoşundan birinə "şigavulun hiravulu" adını versin. Bundan sonra "qol"un qarşısında sınanılmış, təcrübəli oxcular, qılıncoynadanlar, nizətullayanlar və bahadırlardan ibarət böyük bir hiravul düzsünlər, çünki hiravulun məhz bu qoşunları güclü surən salıb (urra çəkib) düşməni məğlubiyyətə uğradacaqdır... Sərdar əvvəlcə onlara qarşı böyük hiravul dəstələrini üz-üzə gətirməli və döyüşə buraxmalıdır. Bunun arxasınca böyük hiravula kömək üçün çapavul hiravulunu və şigavul hiravulunu döyüşə buraxmaq lazımdır. Onların arxasınca gərək çapavulun ikinci qismi və şigavulun birinci bölüyünü döyüşə göndərmək gərəkdir. Əgər düşmənə endirilən bu yeddi zərbədən sonra da qələbə əldə olunmasa, o zaman bərangar və cəvanğarın hiravulu cəngə başlamalıdır. Bununla düşmənə doqquz zərbə vurulmuş olacaq. Əgər doqquz zərbədən sonra da fəth və zəfər müyəssər olmasa, bərangarın birinci bölüyü və cəvanğarın ikinci bölüyünü döyüşə yeritmək lazımdır. Əgər bu on bir zərbədən sonra da qələbədən səs-soraq çıxmasa, bərangarın ikinci bölüyünü və cəvanğarın birinci bölüyü döyüşə başlamalıdır. Bu on üç zərbədən sonra düşmənin yeniləcəyinə və qələbəyə ümid etmək olar. Əgər bu on üç zərbədən sonra da fəth və zəfər hasil olmasa, sərdar gərək qolun əsgərlərini vuruşa hazırlayaraq, özü də onlarla bərabər cəngə yerisin, özünü düşmən gözünə dağ tək göstərib ağır-ağır hərəkət etsin. Döyüş bahadırlarına buyursun ki, qılınclarını çəkib hücuma keçsinlər, oxatanlar isə yaylardan ox yağdırsınlar. Əgər bu zaman da zəfər və fəth əldə olunmasa sərdarın özü gərək cəng meydanına girsin." *(Bax: Temur Tüzukları, Daşkənd, 1996, səh. 129-130, özbək dilində).*

Deməli, Əmir Teymur tərəfindən öz ordusu üçün müəyyənləşdirilən bu döyüş yürüşündə ordunun hiravul, şigavul, cəvanğar, bərangar, çapavul və qol hissələrinin iştirakı həyata keçməli, qələbə əldə olunmalıdır. Şübhəsiz ki, belə hərbi-texniki manevrlər fərdi xarakter daşımış,



Qaraqoyunlu və Ağqoyunlu hökmdarları öz ordularına və qayda-qanunlarına xas döyüş planları hazırlamışlar, lakin onların da ordularında bu monqol-cığatay hərbi istilahları işlənmiş, cəng düzümü əsasən yuxarıda göstərildiyi kimi olmuşdur.

Ordu ilə əlaqədar istilahlardan biri də «yasaq»dır. Şahın asılılığında olan əmirlərin hamısı əmr alan kimi ətraf yerlərdən qoşun toplamağa başlayırdılar ki, bu əməliyyat yuxarıda göstərildiyi kimi «yasaq» adlanırdı. Yasaqdan ötrü əyalətlərə yüzlərlə mülazim göndərilirdi.

Döyüş başlamazdan əvvəl ordunun «qarovul» adlanan müəyyən dəstəsi kəşfiyyata çıxır və bu dəstəyə məşhur əmirlər rəhbərlik edirdi.Qarovulun vəzifəsi düşmənin hərbi qüdrət və vəziyyətini öyrənmək və mümkün olduqda əsir ələ keçirib geri qayıtmağ idi ki, bu əməliyyat mənbələrdə «zəbangiri» («dil tutmaq») adlanmışdır.[157]

Ə.Tehrani qarovulun vəzifəsi barədə əsərinin bir yerində belə məlumat verir: «Nəhayət qarovul xəbər gətirdi ki, Rüstəm bəy öz yerində dayanıb və hərəkət etməyə hazırlaşmır. Rüstəm bəyin qarovulunun sayı nəzərdə tutulduğundan artıq olduğu üçün sahibqranın qarovulu cilovları çəkib geri döndü və vəziyyəti ərz etdi. Onların (Qaraqoyunluların – Ş.F.) qarovulu isə təpənin üstünə çıxıb Ağqoyunlu ulusunu müşahidə etmək imkanı qazandı və onların kəmiyyət və keyfiyyəti barədə tam məlumat əldə edə bildi»[158]

Uzun Həsən Ağqoyunlunun Sultan Məhəmməd Fatehlə etdiyi həlledici döyüş barədə (1473, Otluqbeli) «Sultan Məhəmməd Fatehin yarlığı» adlanan rəsmi sənəd diqqəti cəlb edir. Yarlığın əvvəlində Otluqbeli döyüşünün başlanma səbəbi göstərilir. Yarlığdan məlum olur ki, döyüş 1473-cü ildə çərşənbə günü Başkənd yaxınlığında, Otlubeli adlanan yerdə baş vermişdir. Yarlığa görə, Ağqoyunlu qoşununun hərbi tərtibatı aşağıdakı kimi idi:

---

[157] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə...,səh.70.
[158] Kitabi-Diyarbəkriyyə. Səh.148.

- Pişdarda (münqəlay), yaxud öndə – Uzun Həsən, təvaçi Bayandur bəy, Əli Mirzə, Şahəli bəy Pornak, İbrahimşah bəy, Gavur İshaq;

- Cəvanğar (sol qol) alayında – Uzun Həsənin oğlu Zeynal Mirzə, Qaramanlı Pirəhməd, Məhəmməd bəy, Süleyman bəy, Möhdar Şeyx Əli, Əli paşa;

- Bəranğar (sağ qol) alayında – Uğurlu Məhəmməd, sahibqran Teymur bəyin övladlarından Məhəmməd Bəkir Mirzə, Zeynal Mirzə və Müzəffər Mirzə, Hacı bəy, Rüstəm bəy və Şahməhəmməd bəy.[159]

Yarlığın məlumatına görə Ağqoyunlu-Osmanlı hərbinin başlanmasına səbəb daha böyük hakimiyyətə çatmaq uğrunda iki hökmdarın bir-biri ilə qəti savaş istəyi olmuşdur, çünki bölgədə bu iki dövlətin siyasi və iqtisadi mənafeyi toqquşmaqda idi.[160]

İndi də bir qədər XV əsr Azərbaycan hərbiçilərinə və hərbi vəzifələrə nəzər yetirək:

**Əmirlər:** Dövrün mənbələrində feodal dövlətlərimizin əsas quvvəsi olan yüksək əmirlər zümrəsinin tutduğu mövqe «əmarət» adlandırılmış, əmirlərə isə «alimiqdar, alitəbar, əzəmətli» əmirlər deyilmişdir.

Əmirlər aşağıdakı iki hissəyə bölünmüşdürlər:

1. Əllərində soyurqal (şərti torpaq mülkiyyətinin bir növü – Ş.F.) olan və böyük imtiyazlara malik böyük əmirlər;

2. Kiçik əmirlər.

Təbii ki, «böyük əmir» istilahı altında əllərində böyük hərbi səlahiyyətləri olan əmirlər nəzərdə tutulur. Məsələn, Əli bəy Ağacəri hökmdar Cahanşah Qaraqoyunlunun hakimiyyəti zamanı böyük əmir idi və bu haqda oxuyuruq: «Əli bəy Cahanşahın şahlığı dövründə «əmiri-bozorg» («böyük əmir») idi.[161] Yaqub Ağqoyunlu zamanında böyuk qudrətə malik olan məşhur Sufi Xəlil Mosullu da, yuxarıda

[159] Şahin Fazil Fərzəlibəyli. Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə, Bakı, 1995, səh.49.
[160] Ş. Fərzəlibəyli. Azərbaycan ..., səh.48.
[161] Tarixi-qızılbaşan. Səh.11



göstərildiyi kimi, «əmiri- bozorg» olmuşdu.[162] XV əsrdə fəaliyyət göstərmiş əmirulumərа, böyük əmir və kiçik əmirlərin kimliyinə diqqət yetirdikdə məlum olur ki, məşhur əmirlər, məşhur tayfa nümayəndələrindən seçilmişlər. Məsələn, mosullu, pornak, şixavənd, çəpəni, bayat, ərəbgirlu, əlpavut, baharlu, cagirlu, qaramanlı, sədlu tayfalarina mənsub onlarla səlahiyyətli əmir məlumdursa, vərsaq və oxlu tayfalarından böyük əmirlər çıxmamışlar. Mənbə bu barədə belə məlumat verir : «Vərsaq tayfası – onların əsilləri yunan ölkəsindəndir ki, hal-hazırda «Qaraman» adı ilə məşhurdur. Xaqani-İskəndərşan və cənnətməkan padşah (I Şah İsmayıl və I Şah Təhmasib – Ş.F.) dövründə onların mötəbər əmirləri yox idi. Kiçik əmirləri isə Musa bəy, Xaf hakimi Həsən Xəlifə, həmçinin Mustafa bəy və Dürhəsən Xəlifə olmuşlar».[163] Oxlu tayfasının da mötəbər əmiri məlum deyildir. «Bu tayfanın mötəbər əmiri yox idi və onlar Səfəvi xanədanının müridləridirlər.[164]

«Kiçik əmirlər» zümrəsinə daxil olan əmirlər «ordu əmirləri» də adlanırdı. Onlar müxtəlif qoşun dəstələrinə başçılıq edən əmirlər olmuşlar. Zənnimizcə sərhədləri qoruyan əmirlər də «kiçik əmirlər» zümrəsinə daxil idilər.

Müharibələr zamanı ələ keçirilən qənimətlər çox hallarda əmirlər arasında bölüşdürülürdü ki, şah bununla da onları özündən razı salmaq və gələcək döyüşlərə rəğbətləndirmək istəyirdi. Elə hal da olurdu ki, əmirin döyüşlə ələ keçirdiyi hər hansı bir yer elə onun özünə bağışlanırdı.

Əmirlik XV əsrdə nəsli xarakter daşımışdır. Misal olaraq deyə bilərik ki, 1458-ci ildə Cahanşah Qaraqoyunlunun əmiri Bayazid Cagirlu (o, əmirul-ümərа Əmir Bəstam Cagirlunun oğlu idi – Ş.F.) öldükdə, onun yerini qardaşı Əbülfəth bəy tutmuş və əmir olmuşdu.[165]

[162] Yenə orada səh.22.
[163] Tarixi -gizilbaşan, səh.40.
[164] Yenə orada.
[165] Şahin Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ..., səh.58-59.

Bəzi əmirlərə xidmətlərinə və qazandıqları hörmətə görə böyük torpaq sahələri – soyurqal və tiyul verilir və onlar müharibə bitdikdən sonra həmin yerlərə gedib mülkü işlərlə məşqul olurdular, lakin şah yeni müharibəyə başlarkən əmirlər yenidən xüsusi əmrlə orduya səfərbər edilirdilər.

Əmirlərə müxtəlif ləqəb və titullar verilirdi, onlar soy ada malik olmadıqlarından daşıdıqları vəzifə onların adlarına əlavə edilir, yaxud doğulduqları şəhər, ya kəndin adı soy ad kimi onlara mənsub edilirdi.[166]

**Qorçilər.** Bəzi tədqiqatçılar «qorçi» istilahını yalnız Səfəvəlirlə əlaqələndirir ki, bu düzgün deyildir. Bu istilah altında fəaliyyət göstərən hərbiçilər XV əsrdə də olmuşlar.[167] Məsələn, bizim tez-tez müraciət etdiyimiz «Kıtabi-Diyarbəkriyyə» əsərində də qorçilərdən söhbət gedir.[168]

«Qorçi» sözü Azərbaycan mənşəli «qorumaq» felindən yaranmışdır. Qorçilər arasında nizam-intizamın yüksək olmasından ötrü və orta əsrlərdə tez-tez üzə çıxan tayfa ixtilaflarının baş verməsinin qarşısını almaq məqsədilə hər qorçi dəstəsinin üzvləri yalnız bir tayfa nümayəndələrindən ibarət olmuşdur. Qorçilər mənsub olduqları yer və tayfanın adı ilə adlanmışlar: Naxçıvan qorçiləri, şamlu qorçiləri və s.

Şahların xüsusi mühafizəçiləri olan qorçilər müharibə vaxtı ehtiyatda qalır, yalnız ən çətin məqamlarda döyüşə çıxarılırdılar. Şücaətli qorçi göstərdiyi xidmət müqabilində əmirlər zümrəsinə də daxil edilirdi.[169] Qorçilərin aşağıdakı qrupları məlumdur :

1.Ox və kaman qorçisi;
2.Qılınc qorçisi;
3.Hərəm qorçisi;
4. Şah məiyyətində olan yüksək hərbiçilərin qorçisi və s.

Qorçilərə divan tərəfindən illik məvacib təyin edilirdi.[170]

İndi isə bir neçə hərbi vəzifəyə nəzər salaq:

---

166 Yenə orada. səh.60-61.
167 Yenə orada. səh.65.
168 Kitabi-Diyarbəkriyyə, səh.115,161...
169 Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.66-67.
170 Yenə orada, səh.67.



**Qorçibaşı.** Bu istilah altında xüsusi şah alayının üzvləri olan qorçi dəstələrinin rəhbəri başa düşülür. Qorçibaşı vəzifəsinin sahibi dövlətin ən etibarlı şəxsiyyətlərindən biri olmuşdur. Qorçibaşı qorçilər üzərində böyük ixtiyara malik idi. Müəyyən şikayəti olan hər bir qorçi yalnız qorçibaşı vasitəsilə öz şikayətlərini hökmdara çatdıra bilərdi, əks təqdirdə o, qorçilikdən kənar edilirdi.[171]

**Təvaçi.** Müharibə gözlənilən təqdirdə tabeliyindəki əyalətlərə gedərək, hərbi quvvə toplayan və ayrı-ayrı qoşun dəstələri arasında əlaqə yaradan əmirlər belə adlanmışlar. Onlar döyüşçüləri səfərbər edir, ordunun olacağı yeri onlara bildirirdilər. Döyüşçülərin sayı və ordunun müharibə qudrəti onun «təvaçi dəftəri» adlanan xüsusi kitabçasında qeyd edilərdi.[172]

Teymur Azərbaycana (1386-87, 1392-95, 1399-1405) hərbi yürüşlər etmiş, Təbrizi tutmuş, Şirvanı özünün vassal asılılığına salmış, İranı rəsmi olaraq öz övladlarının idarəsinə tapşırmışdır. Tarixçi Şərəfəddin Əli Yəzdinin "Zəfərnamə" əsərində bu barədə müəyyən məlumat vardır. Müəllif kitabın "Sahibqran həzrətlərinin İran istiqamətinə üç illik yürüşü barədə söhbət" hissəsində "Təvaçi" vəzifəsinin sahibi olan şəxsin gördüyü iş haqqında yazır:

"Pələng (bars) ilinə uyğun gələn h.788-ci ildə (2.II.1386-21.I.1387) Sahibqran həzrətləri İrana yürüş barədə qərara gəldi və dünya şöhrətli yarlıq (hökm) verdi ki, təvaçilər qələbə əzmli qoşun toplamaqla məşğul olsunlar. Fərmana görə qoşun hissələri ətraf ərazilərdən və tərəflərdən dərgaha üz tutub gəldilər." (Bax: Şərəfəddin Əli Vəzdi. "Zəfərnamə" Fars dilindən çevirəni prof. V.Z.Piriyev, Bakı, 1996,səh.3,30"

«Tarixi-aləmarayı-Əmini» əsərində verilən məlumata görə təvaçi vəzifəsi XV əsrin ikinci yarısında əhəmiyyətli dövlət vəzifələrindən biri olmuşdur. Belə ki, qardaşı Sultan Xəlil üzərində qələbə əldə edən və Təbriz taxtında əyləşən Yaqubun «birinci fikri Xəlilin tərəfdarlarının harada olmaları

---

171 Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.63-64.
172 Yenə orada, səh.70-71.

oldu, çünki onlar Xəlilin ölümündən sonra dağılışmışdılar. Dövlət işləri pozulmuşdu, çünki əvvəla Mihməd bəy Alpaut və Qara Məlik Təvaçi edam edilmişdilər».[173] Deməli, dövlət işlərinin (burada Uzun Həsənin vəfatından sonra və Sultan Xəlilin altı aylıq hakimiyyəti zamanındakı dövlət işlərindən söhbət gedir) pozulmasının səbəblərindən biri də «böyük əmirlər» silkinə mənsub olan təvaçinin qətli olmuşdur. Təvaçinin «böyük əmirlər» silkinə mənsub olduğu barədə isə belə bir qeyd vardır: «Muşda böyük əmirlər Yusif bəy ibn Xurşud bəy (təvaçi – Ş.F.) və Məhəmməd bəy Duxarlu gəlib orduya qoşuldular».[174]

Fərzullah Xunci özünün son dərəcə qiymətli mənbəində «təvaçi» və «bukavul» vəzifəsi daşıyan əmirləri təxminən eyni cür səciyyələndirir: Uzun Həsəndən sonra hakimiyyətə gələn Sultan Xəlil qardaşı Yaqubu Diyarbəkrə yollayır. Yaqub Təbrizdən çıxan kimi şiddətlə qar yağmağa başlayır və şahzadənin hərəkəti çətinləşir. Diyarbəkrə çatmağa beş fərsəx qalmış qar elə qalınlaşır ki, F.Xunciyə görə, «hətta iki qar divarı arası ilə gedən dəvələrin başları belə görünmürdü». Belə şəraitdə yolun təmizlənməsindən ötrü məhz təvaçi əskərləri səfərbər edilir. F.Xuncinin ikinci misalı da elə Xəlil və Yaqub Ağqoyunlu qardaşlarının taxt-tac mübarizəsi ilə bağlı gətirilmişdir. Müəllif yazır ki, Yaqub Təbrizə hucuma yollananda Diyarbəkri tərk edərək «it yolu» adlanan yoldan keçib Muşa gəlməli olur. «Bu yol çox çətin keçilən bir yoldur və buna görə də bakavullara qoşunun keçidini təmin etməkdən ötrü əmr verilir».[175] Bu misaldan təvaçinin bir vəzifəsi də aşkara çıxır.

Qaraqoyunlu Pirbudağın-Məhəmməd Əlişir, Uzun Həsənin-Xəlil, onun oğlu Sultan Xəlilin-Qara Məlik adlı təvaçiləri olduğu məlumdur. Cahanşah Qaraqoyunlunun

---

[173] Fəzullah Xunci. Göst.əsər, səh.55.
[174] Fərzullah Xunci. Göstərilən əsəri, səh.51.
[175] Yenə orada. səh.46,51.



təvaçisi Pir Məhəmməd bu hökmdarın ən yaxın əmirlərindən idi.[176]

**Tuqaçi.** Bu istilahın mənası barədə hələ məlumat yoxdur, lakin ingilis tədqiqatçısı Ç.N.Seddon onun «xəbəraparan» olduğunu bildirir. Həsən bəy Rumlu tuqaçinin elçi sifətilə göndərildiyi barədə söz açdığına görə bu vəzifə sahiblərinin həqiqətən də xəbər çatdıran olduqlarını güman etmək olar.

Mənbələrdə iki tuqaçi vəzifəsinə təsadüf olunur: şəhər tuqaçisi və ləşkər tuqaçisi.[177]

Ə.Tehrani yazır ki, Cahanşah Seyid Əhməd Tuqaçini 1453-cu ildə İsfahanı dağıtmağa yollamış və tuqaçi özü ilə 50 min nəfər adam toplamış və barıları yerlə yeksan etmişdi.[178] Bu misaldan tuqaçinin təkcə xəbəraparan deyil, həmçinin müxtəlif tapşırıqların də icraçısı olduğu aydınlaşır.

Tuqaçinin divanı da olmuş və həmin divan «divani-əmarəti-tuqaçi» adlanmışdır.[179]

**Qəcərçi.** Bu vəzifə sahibi haqqında məlumat yox dərəcəsindədir. Ə.Tehrani Uzun Həsənin Pirəli bəy Şahnisbi adlı qəcərçisi olduğunu bildirir və onun məlumatına əsasən bu vəzifənin məzmunu aydınlaşır. O, yazır: Uzun Həsən gedəndə (1448) Quxbir adlı bir çayın kanarında dayanmağa məcbur olmuşdu, çünki çayı keçmək mümkün deyildi. «Pirəli bəy Şahnisbi qəcərçi idi. Sahibqran onu göndərdi ki, axtarıb bir keçid tapsın ... Qəcərçi keçidi tapa bilmədiyi üçün sahibqran özü daim xoşbəxt xislətindən işıq saçan fərasət nurunun sayəsində keçidi aşkara çıxardı və bütün qoşun həmin keçiddən keçdi. »[180]

**Nəqbəçi.** Azərbaycanca «lağım» mənasını verən «nəqb» ərəb ismindən düzəldilən sözdür. Nəqbəçilər (yaxud nüqqab) mühasirə vaxtı qala və şəhər divarlarını lağım atmaqla uçuran əsgərlər idilər.[181]

---

[176] Yenə orada. səh.71.
[177] Kitabi-Diyarbəkriyyə, səh.72.; Ş.Fərzəliyev. Yenə orada, səh.71.
[178] Kitabi-Diyarbəkriyyə, səh.176.
[179] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.71.
[180] Kitabi-Diyarbəkriyyə, səh.134.
[181] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.73

**Əmiraxur.** XV əsr Azərbaycan ordularında minik heyvanlarına nəzarət və nəqliyyat məsələlərinə rəhbərlik etmək əmiraxurun öhdəsinə düşürdü. Qoşunların əsas minik vasitəsi olan at ilxılarının ümumi sayı haqqında hökmən əmiraxurun məlumatı olmalı idi. Sultan Əhməd Cəlairinin məğlub olub qaçmasından sonra əsir alınmış düşmən əmiraxurlarına Qara Yusifin verdiyi suallar bu fikrin təsdiqi üçün səciyyəvidir: «Sultanın neçə atı vardı? O, özü ilə neçə at aparmış olar? Ordumuzun əlinə daha neçə at keçə bilər?»[182]

Müharibə vaxtı ordu ilə hərəkət edən əmiraxurlar da şəxsən döyüşürdülər. Ə. Tehrani Uzun Həsənin əmiraxurunun hərbi fəaliyyətini bildirən belə bir məlumat verir: «... Qasım Əmiraxurun başçılıq etdiyi qoşun Nəsibin və Mardinin bəzi hissələrini qarət edib geri döndü».[183]

Beləliklə XV əsr Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin hər üçünün hərbi quruluşu arasındakı tam yaxınlıq bir daha təsbit edilmiş olur. Dövrə dair mənbələrdə və tarixi ədəbiyyatda buna görə də hər üç feodal dövlətin quruluşlarındakı yaxınlıq dönə-dönə əks etdirilmişdir.

M ə h k ə m ə s i s t e m i n ə gəldikdə də eyni yaxınlıq nəzərdən yayına bilmir. Qəti şəkildə demək olar ki, Azərbaycanın XV əsrdə mövcud olmuş hər üç dövlətində məhkəmə sistemi eyni tərzdə təşəkkül tapmışdı və demək olar ki, eyni şəkildə həyata keçirilir və müsəlman hüququna əsaslanırdı. «Orta əsrlər Azərbaycan hüquqşünaslığı ... müsəlman hüququnun üzvi bir hissəsi olub mahiyyətcə heç bir cəhətdən ondan fərqlənmirdi».[184]

Müsəlman hüququ ümumi şəkildə şəriət adlanan elmlər sistemində formalaşmışdır. Şəriət cəzanı yalnız zahiri əlamətə görə, əmələ, formaya görə verir. Şəriət hökmləri iki qrupa bölünür:

1.Ruhani-mərasim hökmləri;

[182] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə ...,səh.148.
[183] Kitabi-Diyarbəkriyyə, səh.130.
[184] Elman Cəlilov. Azərbaycanın dövlət və hüququ (XIll-XIV yüzillər), Bakı, 1995, səh.44-45.



2.Mülki-siyasi hökmlər.[185]

Müsəlman dövlətlərində dini hakimiyyət ilə dövlət hakimiyyəti bir-birindən ayrı deyilsə də, bizim bəhs etdiyimiz dövrdə dövlət hakimiyyəti XVl əsrə nisbətən güclü idi. Məsələn, müəyyən hökmlərin çıxarılması və cəzaların verilməsində əsas və qəti söz hökmdarın olduğuqndan məhkəmə başçıları – qazilər, şübhəsiz ki, Qara Yusif, Uzun Həsən, Fərrux Yəsar kimi padşahların rəyi ilə hökmən hesablaşırdılar. Məhkəmə hökmlərini adətən ilahiyatcı hüquqşunaslar deyil, nufuzlu feodallar, tayfa başçıları, şeyxlər, ağsaqqallar icra edirdilər.

Məhkəmə məsələləri əsasən məscidlərdə həll edilirdi . «Orta əsrlərin müsəlman aləmində yalnız məşhur ilahiyyatçılar qanunşunas kimi tanınırdılar».[186]

İsmlamın ilk dövrlərində olduğu kimi Qaraqoyunlu, Ağqoyunlu, Şirvan və Osmanlı dövlətlərində qazilər hələ də yerlərdə əsas hakimlər kimi qalmaqda idilər və şəriət məhkəmə aparatına başçılıq edirdilər, şəriət məhkəmə aparatının sərəncamında isə bir sıra idarələr – kargüzarlıq işlərinə baxan və məhkəmə sənədlərini rəsmləşdirən idarələr də vardı. XV əsrdə Azərbaycanda dövlət qaziləri ilə yanaşı şəriət qaziləri də fəaliyyət göstərirdi ki, birincilər ikincilər üzərində güclü təsirə malik idilər.

Qazilərin başçılıq etdikləri məhkəmələr qəza məhkəmələri adlanırdı. Şəri və dünyəvi qəza məhkəmələri biri-birini tamamlamış, xalqın şüurunda bilavasitə dinlə bağlı olan, məsələn nigah, ibadət, ailə, miras, boşanma hüququ üzrə münasibətlər - şəriət məhkəmələri, digər məsələlər isə dövlət məhkəmələri tərəfindən həyata keçirilmişdir.[187]

Teymurilər dövlətində də Qaraqoyunlu və Ağqoyunlu dövlətlərində oldluğu kimi, məhkəmə (dünyəvi və şəri) qazilər tərəfindən aparılır, müqəssirlər "Yasa" qanununun (Çingiz xan "Yasa"sının) müvafiq maddələrinin əsasında

[185] Yenə orada, səh.55.
[186] Q.Kərimov. Göst.əsər, səh.7.
[187] E.Cəlilov. Göst.əsər, səh.60.

cəzalandırılırdılar. Əmir Teymurun məlum əsərində oxuyuruq: "Oğrular haqqında buyurdum ki, harada olur olsun, kim onları tutub gətirsə, oğrular Yasanın tələblərinə müvafiq cəzalandırılsınlar." Cəza barədə qərar çıxarmaq isə, təbii ki, qazilərə xas səlahiyyət idi. Əmir Teymur qaziləri iki yerə ayırır: İslam qazisi, (yaxud şəriət qazisi) və əcrim qazisi ("cürm"- günah, "qüsur"mənasındadır) "Əgər biri başqasının dişini sındırsa, gözünü kor etsə, qulaq və burun kəssə, şərab içsə, zina işlər görsə onu tutub divandakı şəriət qazisi, ya da əcrim işinə baxan qaziyə tapşırsınlar. Şəriətə dair işlərin həlli barədə islam qazisi hökm çıxarsın, ürf-adət işlərini isə əcrim qazisi təftiş edib sonra mənə ərz eləsin." ("Temur tüzukları" səh.94). Əmir Teymur bu əsərinin başqa bir yerində də həmin məsələyə bir daha toxunub yazır: "İslam qazisi şəriət işləri, əcrim qazisi isə dünyəvi işlər haqqında mənə ərz etsin." *(Bax: Həmin əsər, səh. 108)*

Müsəlman hüququnun əsasında fiqh elmi dururdu. Fiqh ərəbcə «dəqiq anlayış, bilik» mənasını verir. Orta əsrlərdə bu istilah islamın ilk dövrlərində olduğu kimi «şəriət» sözünə bərabər tutulmuşdur. Fiqh müsəlmanların dini və dünyəvi həyatlarını tənzim edən normaları özündə toplayıb, həm ibadətlər, həm də miras, əqdlər, ailə münasibətlərini, edilməli və edilməməli (əmr və nəhy) əməlləri qiymətləndirəcək hökmləri, cəza ehkamı, mühakimə usulları, dövlət təşkilatı və müharibə etmə hüququna dair ehkamları özündə birləşdirir. Fiqh müfəssəl mənbələri tədqiq etməklə şəriət ehkamının əməli köklərindən bəhs edən elm olub, qanunverçilik işlərində fərziyyə və layihələr tərtib edərkən müvəffəqiyyət qazanmağa xidmət edir. Fiqh şəriətin mənbələrini tədqiq etməklə onun əməli işlər üzrə ehkamından bəhs edir, şəriət və ədəbiyyat elmlərindən istifadə etməklə nəticə almaq və hökm çıxarmağa xidmət edir.[188]

Deməli, qazilər dövrün məhkəmə sisteminin tətbiqində fiqh qanunlarını əldə əsas tutur və yalnız onlara istinad edirdilər. E.Cəlilovun məlumatlarına görə, qazilər

[188] Yenə orada, səh.61.



fəaliyyətlərini «Qazilik qanunları kitabı» («Kitab ədəd əl-qada») ilə təmzileyirdi və bütün maddi və prosessual normalar bu kitabda toplanmışdı.[189]

Qazi iman əhli olub xalqı ədalətlə mühakimə etməli, qanunsuzluğun qarşısını almalı, kimsənin haqqının mənimsənilməsinə, hüququnun tapdanmasına yol verməməlidir. O öz vəzifəsini şəriətin tələbləri səviyyəsində apara bilmirsə, tutduğu vəzifədən azad edilməlidir. Qazi işi şahidlərin, iddiaçı və cavabdehin, məhkəmə üzvlərinin, məhkəmə xidmətçilərinin iştirakı ilə araşdırır və hökm çıxarır. Qazilik insanlar arasında münasibətləri şəriət ehkamları, fiqhdə toplanmış hüquq normaları və öz rəyinə əsasən həll etməlidir.[190]

Qaziliyi öhdəsinə götürən adam fiqh sahəsində yüksək biliyə malik olmalı, xalqın işini ədalətlə həll edə biləcəyinə əmin olmalı, xalqın və şəxsin özünün etimadını qazanmalı, hər şeyi qorxub çəkinmədən düz deməli, qanunu hətta hökmdardan belə qoruya biləcək qədər cəsur, qorxmaz, iradəli olmalı, fəraiz məsələlərini dəqiq bilməli, insanlar arasında fərq qoymadan məzlumu zalimdən müdafiə etməyə həmişə özündə güc, qüdrət hiss etməli, rüşvət qəbul etməməli və ətrafdakıların da rüşvət qəbul etmələrinə imkan verməməlidir. Hədiyyə olaraq verilmiş şeyləri qəbul etməzdən əvvəl hədiyyənin hansısa məqsədlə verilib-verilmədiyini yoxlamalı, məqsədli hədiyyələri nə özü, nə də ailə üzvləri qəbul etməmiəlidir.[191]

Qazi sübut etmə vəzifəsini yalnız iddiaçının üzərinə qoymamalı, öz səlahiyyətindən istifadə edərək məsələlərin aydınlaşmasını təmin etməlidir.

Qaziliyin yüksək bilik və peşə vərdişini tələb etməsinin nəticəsidir ki, qazi vəzifəsinə fiqhə yaxından bələd olan, ailəliklə qaziliklə məşqul olanlar təyin edilmişlər.[192]

[189] Yenə orada, səh.344,348.
[190] E.Cəlilov. Göst.əsər. səh.348.
[191] Yenə orada, səh.348-349.
[192] Yenə orada, səh.350..

Şahid məhkəmədə ona məlum olan halları düzgün söyləməli, bəzək-düzəkli ifadələrlə hadisəni təhrif etməməlidir. Şahid hadisəni görməli, kimdənsə eşitməli və ya başqa hiss üzvləri ilə duymalı, qavramalıdır. Mənbəyi olmayan şəhadət əsaslı sayılmır.[193]

Fiqhin islam cəmiyyəti həyatını tənzim edən hüquq institutları içərisində birgəyaşayış, müharibə və sülh bağlama qaydalarına aid hissəsi xüsusi əhəmiyyətə malikdir. Bu hissəyə 4 institut daxildir. «Haqsızlığın dəf edilməsi və ədalətin, dostluğun təmin edilməsi», «Yürüş», «Cizyə» və «Hüdanə» kitablarına daxil olan normalar.[194]

XV əsrdə Azərbaycan tarixində baş verən ciddi dəyişiklər, bir yüzillikdə iki feodval dövlətin yaranması (Qaraqoyunlu və Ağqoyunlu) və Şirvanşahlar dövlətinin yeni şəraitə uyğunlaşması nəticəsində «Cahad» kitabı demək olar ki, aradan çıxarılmış, cinayət hüququndan sonraya keçirilərək «Yürüş», kitabı adlı hissə yaradılmış, cahada və müharibə aparılmasına dair normalar orada toplanmışdır. Məsələn, Uzun Həsən bəzən kiçik dövlətlər üzərinə, yaxud Gürcüstana hucumları zamanı yürüş haqqında fərman verir və din xidmətlərinin, xususilə qazinin fivası ilə yürüşlərini əsaslandırırdı. Onun Osmanlılarla döyüşü isə, özü və tərəfdarları tərəfindən «cahad» adlandırılmışdı.

Fiqh cahad edib islam düşmənlərini əzməyi hər bir müsəlmanın borcu olmasını təsbit etmişdir, düşmən əzilməsə islam, islam olmasa Allaha həqiqi inam ola bilməz, o da olmasa, həyatın mənası qalmaz, buna görə də cahadda ölmək yaşamaqdan daha vacibdir. Əbülqasım Hillinin əsərinə əsaslanan E.Cəlilov cahadı iki yerə ayırır: birincisi, islama hucum edib onu yıxmaq istəyənlərə qarşı cahad; ikincisi, dini zərurət və şəriətin tələblərini yerinə yetirmək üçün cahad. Cahad hər şeydən əvvəl, canını belə əsirgəmədən din yolunda

[193] Yenə orada. Göst.əsər. səh.365
[194] Yenə orada, səh.370.



fədakarlıq göstərməkdir. Cahad islam dinini müdafiə etməklə müsəlmanların canını, mənəviyyatını və əmlakını qoruyur.[195]

XV əsr Azərbaycan mənbələri arasında elə kitab tapmaq mümkün deyildir ki, orada cahad, qəza, qazi, quzzat barədə az da olsa məlumat olmasın. «Qəza», yəni məhkəmə işləri ilə məşqul olan qazi haqqında mülahizə yürüdərkən iki qazidən danışmaq lazımdır: 1.Qazi – yəni, mülki və dövləti işlərlə məşqul olan şəri qazi; 2. Hərbi işlərdə qayda-qanun bərqərar olmasına çalışan qoşun qazisi (qaziyi-əsgər).[196] Şəri qazi yerlərdə mübahisəli məsələlərin həllinə çalışır, qoşun qazisi isə orduda dini iş və təbliğat aparır, günahkar hərbiçiləri mühakimə edirdi.

Bacarıq və qabiliyyətlərinə görə bəzi qazilər sədr və vəzir kimi yüksək vəzifələrə layiq görülürdülər. Məsələn, 1419-cu ildə Şirvanşahlar dövlətində vəzir Qazi Bayazid olmuşdur. Yaqub Ağqoyunlu sarayın sədri isə Qazi İsa idi. Hətta Ağqoyunlu Qara Osman tərəfindən öldürülən Qazi Bürhənəddin Bürhanilər dövlətinin padşahı idi.[197]

Bəzi mühüm məsələlərin həlli üçün qazilərin köməyindən istifadə edilirdi. Məsələn, 1469-cu ildə Sultan Əbu Səid Teymurinin Azərbaycana yürüşü zamanı Uzun Həsən əskər qazisi Əlaəddin Əlini iki dəfə sultanın düşərgəsinə yollamışdı.[198] Tezliklə Ağqoyunlular tərəfindən əsir alınan Sultan Əbu Səidin qətlinə fərmanı da uzun Həsən məhz Şirvan qazisinin təhriki ilə vermişdi.[199]

İslamın xeyrinə çalışan Qazi Əlaəddin Əli barədə Ə.Tehraninin məlumatı da diqqəti cəlb edir : «Sahibqran ... seyidlərin qaymağı, qazilərin iftixarı, sağlam düşüncə sahibi, kəskin fikirlər yiyəsi, aydın nitqi və güclü məntiqi, zəngin biliyi və təmiz mənəviyyatı sayəsində elçilikdə mahir olan və

[195] Yenə orada. səh.370.
[196] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.58..
[197] Yenə orada, Kitabi-Diyarbəkriyyə, səh.52.
[198] Kitabi-Diyarbəkriyyə, səh.. 254-255.
[199] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə ...,səh.58.

bu işdə islamın xeyrinə çalışan qazi Əlaəddin Əlini layiqli hədiyyələrlə Cahanşah Mirzənin yanına göndərdi».[200]

Ə. Tehrani qazini «şəriət hakimi» adlandırır. Cahanşahın öldürülməsindən sonra Təbrizə gələn Uzun Həsən «Təbrizin və ... digər şəhərlərin alimlərini və seyidlərini öz hüzuruna dəvət etdi, məmləkət və din işləri ilə məşqul olanlara nəsihətamiz sözlər dedi. Qazilərin və şəriət məsələlərinə baxan adamların xəyanəti barədə şikayətlər eşitdiyi üçün qaziləri hədələdi və bir neçə gündən sonra onların hamısını işdən azad etdi. Türk möminlərindən biri mənim (Abubəkr Tehraninin – Ş.F.) təqdimatım və digər əyanların müdafiəsi ilə şəriət hakimi təyin olundu.»[201] Salnaməçi bu qeydlə qazilərin islamın müdafiəçiləri olduqlarına baxmayaraq, bəzən özlərinin qeyri-hüquqi işlərə əl atdıqlarını nəzərə çatdırır. Qazinin iştirakı olmadan evlənmə və boşanma məsələləri əsasən həyata keçmirdisə də, bəzən hər hansı bir hökmdar, yaxud şahzadə bu hüquqi normaya əhəmiyyət vermir, qazinin rəyi ilə hesablaşmırdılar. Məsələn, Cahanşahın qətlindən sonra onun oğlu Həsənəli ilə də birdəfəlik hesablaşmaq istəyən Uzun Həsən ona qarşı yola düşür. Ə.Tehraniyə görə «Onun Azərbaycana yollanmaq və Həsənəlinin qarşısını almaq qərarının əsas səbəbi onun daim eşitdiyi belə bir xəbər idi ki, Həsənəli islam dininin düzgün yolundan sapıb ..., şəriətin göstərişlərini unudub ... əyanlardan hansını bir bəhanə ilə cəzalandırırsa, elə həmin gün onun qadınlarını talaqsız və qazisiz başqalarına verir».[202] Beləliklə, nəticə çıxarmaq olar ki, hər üç Azərbaycan feodal dövlətində hərbi quruluş və məhkəmə sistemi özlərindən əvvəlki dövlətlərin təcrübi xüsusiyyətlərinə əsaslanmışdı.

---

[200] Kitabi-Diyarbəkriyyə, səh.221.
[201] Yenə orada, səh.279.
[202] Kitabi-Diyarbəkriyyə, səh.246.



## II FƏSİL:

## QARAQOYUNLU, AĞQOYUNLU VƏ ŞİRVANŞAHLAR DÖVLƏTLƏRİNİN İQTİSADİ QURULUŞUNUN ƏSAS XÜSUSİYYƏTLƏRİ: ƏMLAKIN HÜQUQİ VƏZİYYƏTİ, VERGİ VƏ MÜKƏLLƏFİYYƏTLƏR.

XV əsr Azərbaycan feodal dövlətlərinin iqtisadi quruluşları da yalnız şəriət qanunları əsasında formalaşmışdı. Əmlakın hüquqi vəziyyəti də fiqh elminin tələbatına müvafiq idi. Fiqhdə ən geniş yeri müsəlmanlar arasında əmlak münasibətlərini tənzim edən normalar tuturdu. Fiqhdə əmlakla əlaqədar ictimai münasibətləri tənzim edən hüquq institutları ibadətə dair normalardan sonra başlayır. Hər hansı hüquq institutunda konkret normalar ilə həll edilmiş ictimai-iqtisadi münasibət digər hüquq institutunda təkrarlanmamış, fiqhin ümumi qəbul olunmuş tələbi kimi hər bir konkret halda qazi və müftilər tərəfindən tətbiq edilmişdir. Hüquqi varislik, hüquq və vəzifələrin keçmə anı, hüquq və fəaliyyət qabiliyyətinə dair məsələlər də eyni qaydada həll olunurdu. Müsəlman hüququ mülkü huquq münasibətlərini əmlak və qeyri əmlak, mütləq və nisbi, şey və öhdəçilik kimi hüquq münasibətlərinə də ayırmamışdır. Müsəlman mülki hüquqi əmlakla əlaqədar olmayan mülki hüquq obyekti tanımır.[203]

Əmlakın hüquqi vəziyyətinə nəzər saldıqda görmək olar ki, mylkiyyət hüququnun obyekti ola biləcək maddi əmlak növləri heç nə ilə məhdudlaşmır. Bütün istehlak dəyərinə malik olan şeylər mülkiyyətin obyekti ola bilər, lakin bir istisna vardır: islam dini ilə haram hesab edilən şeylər müsəlmanın mülkiyyətində ola bilməz və qanunla da müdafiə olunmur.[204]

Mülkiyyət əldə etməyin əsas üsulu müqavilədir. Zəhmətlə qazanc əldə etmək, irslə almaq, həyat-bacadan, şəxsi mal-qaradan əldə edilən gəlir də halaldır. Bağışlama, tapıntı və

---

[203] E.Cəlilov. Göst. əsər, səh.160-162.
[204] Yenə orada, səh.163.

digər yollarla ələ gələn maddi nemətlər yalnız o halda halal hesab olunur ki, fiqhin tələb etdiyi şərtlərə – müddətin keçməsinə bağışlanan malın halal olmasına və sairəyə əməl edilsin. Mülki hüquqlar, o cümlədən mülkiyyət hüququ müsəlman hüququnun ümumi ehkamlarından doğan inandırma, axirət dünyasında veriləcək cəzalar, əxlaq qaydaları və nəzərdə tutulmuş hallarda şəriət məhkəmələri vasitəsilə həyata keçirilir. Hər bir müsəlman özünü və əmlakını hər cür qanunsuzluqdan və zorakılıqdan müdafiə edə bilər, digər mömin müsəlmanlar də onu müdafiə etməyə borcludur, lakin nəzərə alınmalıdır ki, cəzalandırma hüququ yalnız şəriət məhkəməsinə verilir. Öz əmilləri ilə başqalarına zərər vurmuş müsəlman vurduğu zərəri könüllü olaraq ödəməyə borcludur, belə etmədiyi təqdirdə axirət günündə layiq olduğu cəzanı alacaqdır.[205] Şübhəsiz ki, bütün bunlar şəriətin əmlak hüququ barədə olan nəzəri normalarıdır. Əməli olaraq isə feodal dövlətlərimizin hər biri öz hökmdarlarının və hakim feodal sinfin dedikləri ilə idarə olunurdu.

XV əsrdə Azərbaycanda bərqərar olan hər üç dövlətin ərazilərində olan bütün torpaq və mülklərin ümumi sahibkarı, məlumdur ki, şah (şirvanşah) olmuşdur. Amma şahın razılığı və fərmanı ilə Azərbaycan 4 feodal sinfi arasında bölünmüşdü və feodalların kəndlilər üzərində hökmranlığının iqtisadi əsasını torpaq üzərində feodal mülkiyyəti təşkil edirdi. Bu iqtisadiyyatin aparıcı növü isə əkinçilik deyil, maldarlıq idi. «Asiya istehsal usulu» konsepsiyasında irəli sürüldüyü kimi mücərrəd deyil, gerçək surətdə mövcud olan feodal mülkiyyəti daha çox dövlət mülkiyyəti formasında çıxış edirdi. Dövlət mülkiyyətinin üstünlük təşkil etməsi başlıca olaraq onunla izah edilirdi ki, dövlət əkinçiliyinin və deməli, minlərlə insan həyatının asılı olduğu süni suvarma qurğularının mülkiyyətçisi idi. Torpaq üzərində dövlət mülkiyyəti torpaq vergisi şəklində (xərac, malcehat) xəzinəyə daxil olan məhsul payının (renta-vergi) mənimsənilməsində ifadə olunurdu. Feodalların istifadə etdiyi vergi toxunulmazlığı imtiyazına (yəni vergi ödəməkdən

[205] E.Cəlilov. Göst. əsər, səh.164.



azad olunmaq) dövlətin həmin ərazidə özünün müstəsna səlahiyyətinə güzəşti kimi baxılırdı.

Müsəlman hüququ torpaq sahibliyinin beş əsas növünü qəbul edirdi:

1.Dövlət torpaqları (xəzinə torpaqları) – əraziyi-divani;
2.Hakim sülalənin şəxsi mülkləri – əraziyi-xassə;
3.Müsəlman ruhani idarələrinə vəsiyyət edilmiş torpaqlar– ərziyi-movqufat ;
4.Xüsusi mülkiyyətdə olan torpaqlar - mülk;
5.Kənd icmalarının mülkiyyəti olan torpaqlar – cəmaətiye-deh.[206]

Bütün idarə orqanlarının iki böyük kateqoriyaya - dərgah (saray) və divana (dəftərxana) bölünməsi müsəlman Şərqinin, o cümlədən də Azərbaycanın siyasi təşkilatının bütün sisteminin əsas xəttini təşkil edirdi. Torpaq sahibliyi kateqoriyalarının idarələri «divani-məmalik» və «divani-xassə» adlanan, hər birinin çoxlu məmurlar ştatı olan iki müxtəlif idarədə mərkəzləşdirilmişdi.[207]

Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin hakimiyyəti zamanı Azərbaycanda Səfəvi şeyxlərinə mənsub olan vəqf mülkləri mövcud idi. Müxtəlif feodal hakimlərin hədiyyə verdiyi torpaqlar sayəsində vəqf mülkləri genişlənməkdə idi. Qeyd olunmalıdır ki, vəqf torpaq mülkiyyəti sahəsinin artım mənbələri yalnız hökmdarların bəxşişlərindən ibarət deyildi. Bu dövrdə torpaq sahibləri arasında gözə çarpan faydadan çıxış edərək öz mülklərini vəqfə çevirmək ənənəsi özünü göstərirdi. Məlumdur ki, vəqflər adətən vergi və inzibati toxunulmazlıq hüququndan istifadə edir, çox nadir hallarda müsadirəyə məruz qalırdı. Həmin feodallar bu yolla öz mülkiyyətlərini ruhanilərin etibarlı mühafizəsi altında keçirir və öz soyadının ardınca mütəvəlli (vəqf işləri müdiri)

[206] O Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, Bakı,1993, səh.184-185.
[207] Yenə orada. Göst.əsər, səh.187.

vəzifəsini yazdırmaqla xəzinəyə ödəyəcəyi vergilərdən canlarını qurtarırdılar.[208]

Azərbaycanda bütün XV əsr boyu iqta, soyurqal və tiyul institutları fəaliyyətdə olmuşdur. İqta təsisatı XVI əsrə qədər mövcud olsa da, bu istilaha sonrakı əsrlərdə də təsadüf olunur. Deməli, sonrakı əsrlərdə də ara-sıra işlənən bu istilah onu əvəz edən soyurqalı və tiyulu bildirirdi. İndi isə vəqf, iqta, soyurqal və tiyul institutları barədə müxtəsər məlumat vermək məqsədə müvafiqdir.

**Vəqf mülkiyyəti.** İslam dini müəssisələrinin olduqca gəlirli torpaq mülkiyyəti vəqf idi. Müsəlman və xristian idarələrinə məxsus olan vəqf mülkləri «vəqfi-xeyri» «xeyriyyə vəqfləri» adlanırdı. Seyidlərin, dərviş şeyxlərinin, müqəddəs hesab olunan şəxslərin ixtiyarındakı vəqflər isə «vəqfi-əhli» («şəxsə xas vəqf») adı ilə tanınırdı.[209] Vəqf torpaqlarda yaşayan rəiyyət ruhanilərdən asılı idi. Vəqfdən götürülən gəlirin bir hissəsi məscid, mədrəsə və başqa dini idarələrin tikilməsinə xərclənir, onun böyük hissəsini isə ruhanilər mənimsəyirdilər. Dini müəssisələrin ixtiyarında böyük torpaq sahələrindən başqa vəqf olunmuş evlər, bazar, emalatxana, karvansara, dəyirman, bağ, suvarma kanalları və mədənlər də vardı.

Dini müəssisələrin ixtiyarına verilən vəqf əmlakından əldə edilən gəlir dini müəssisələrə sərf olunurdu, lakin bəzən hökmdarın məzarına (gurxana) vəqf edilən movqufatın gəliri oranın mücavirinə çatır və beləliklə, vəqf əmlakının şəxsi mənimsənilməsi hallarından biri yaranırdı. Uzun Həsən Cahanşah Qaraqoyunluya qalib gəldikdən sonra onun oğlu Əbu Yusifin gözlərini çıxardıb, onu atasının məzarına mücavir təyin etmişdi. Bir il sonra hucumla Miyanəyə gələn Sultan Əbu Səid də bu kor şahzadəyə hörmət edərək, atasının qəbrinə edilən mövqufatın hamısına yiyələnməyi ona tapşırmışdı. Fəqf torpaqlarının gəliri vəqfi verən şəxsin vəsiyyətinə əsasən məsrəf edilə bilərdi. Vəqf olunan əmlak

[208] Yenə orada, səh.185-186.

[209] Azərbaycan tarixi, «Elm», lll cild, səh.109.



vəqfnaməyə müvafiq surətdə idarə olunmalıydı. Bu torpaqlardan hökumət üçün vergi yığılmır, vəqf əmlakı toxunulmaz sayılırdı. Məhz buna görə də feodallar get-gedə varlanırdılar.

XV əsrin ll yarısında Azərbaycandakı ən böyük vəqflər bunlar idi: Ərdəbildə Şeyx Səfiəddin məqbərəsi, Təbrizdəki Həsən şah məsçidi, Cahanşah tərəfindən vəqf edilən Cahanşahiyyə vəqfləri, Qazan xanın məzarı.

Vəqf əmlakı satıla və bağışlana bilməzdi.[210]

**İqta institutu.** Bu şərti torpaq mülkiyyəti növü böyük inkişaf mərhələsi keçirmişdir. Əvvəllər o, ayrı-ayrı şəxslərə fəqət o torpaqdan xərac alıb yaşaması üçün verilərdi. Xl-Xll əsrlərdə isə iqta hərbiçilərə əta olunmağa başladı. İqtadar (iqta sahibi) həmin torpaqlarda yaşayan kəndlilər üzərində tam hakimiyyətə malik idi. Azərbaycanda bu torpaq mülkiyyəti (iqta sahibi); artıq monqol hakimiyyəti zamanı (Xlll-XIV əsrlər) irsi idi. XV əsrdə də iqta hərbi torpaq mülkiyyəti növü kimi qalmaqda idi, amma bəzi şahzadələrə də yaşayış yerləri iqta kimi verilirdi. Məsələn, Diyarbəkr şəhəri Ağqoyunlu şahzadəsi Yaqub bəyə iqta şəklində əta olunmuşdu.[211] Əsrin sonunda isə iqta öz yerini soyurqal institutuna verdi.[212]

**Soyurqal institutu.** Özündən əvvəlki iqta institutunun inkişafı nəticəsində yaranan soyurqal institutu Azərbaycanda olan şərti feodal mülkiyyətinin əsas növlərindən biridir. Müəyyən şəxsə soyurqal verilərkən hökm (ehkami-soyurqal) yazılır və ona sənəd (nişani-soyurqal) verilirdi. Soyurqal sahibi hökmən padşahın hərbi və ya mülki xidmətində olmalı, onun mənafeyindən ötrü çalışmalıydı.

Azərbaycanda soyurqallara dair ilkin məlumat XIV əsrin ll yarısına, çəlairilərin (azərbaycanlaşmış monqol feodallarının hakimiyyətdə olan bir sülaləsi – Ş.F.) hakimiyyəti dövrün də

[210] Tarixe-qızılbaşan. səh.16

[211] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə ...,səh.74-75.

[212] И.П.Петрушевский. Очерки по истории феодальных отношений в Азербайджане и Армении в XVI-начале XIX вв., Ленинград,1949, с.153-154. Qeyd: «Soyurqal» istilahı – monqol mənşəli «soyurqamişi» («bəxşiş») istilahından yaranmışdır.

təsadüf edir. Sourqal dövlətdə hərbi və mülki xidməti olan şəxslərə sultan tərəfindən bağışlanırdı və həmin mülk onların irsi istifadəsində olurdu. İqtaya nisbətən soyurqal sahibinin hüquqları daha geniş idi. Soyurqal sahibləri vergi yığımında yə məhkəmə-inzibati fəaliyyətdə müstəqil idilər. Belə ki, soyurqalı olan şəxsin vergi toxunulmazlığı hüququ onun zənginləşmə vasitəsi idi, yəni əvvəllər dövlət xazinəsinə daxil olan vergi yığmaq səlahiyyəti artıq soyurqal sahibinin ixtiyarına keçirdi. Soyurqal sahibinin öz torpaq sahəsində vəzifəyə təyin etdiyi şəxslər yalnız onun qarşısında hesabat verirdilər.[213]

Qaraqoyunlu və Ağqoyunlu hökmdarları soyurqal verməklə mərkəzi hakimiyyəti möhkəmləndirməyə və dövlətdə birlik yaratmağa çalışırdılar, amma sonralar bunun əksi alındı və soyurqal sahibləri olduqca varlanıb, mərkəzi hökumətlə hesablaşmamağa başladılar.

Bəzən soyurqal kimi paylanması nəzərdə tutulan yerlər (başqa ölkə torpaqları) hökmdar tərəfindən hucuma məruz qalarkən «soyurqal əhli olan şəxslər» də döyüşə aparılır və onlara ələ keçirilən torpaqlardan soyurqal verilirdi. Uzun Həsən 1476-cı ildə Gürcüstana yeni yürüş edərək özü ilə bir dəstə seyid və şeyx aparmış, nəticədə xeyli soyurqal paylamışdı. Bəzi hökmdarlar çoxlu soyurqal verməklə özlərinə arxa yaratmağa çalışırdılar (Rüstəm Ağqoyunlu), bəziləri isə soyurqal paylamadıqlarına görə öldürülmüşdülər (Gödək Əhməd).

Soyurqalın üç növü məlumdur: Torpaqla verilən soyurqal; pul ilə ödənilən soyurqal; müştərək istifadə üçün verilən soyurqal.[214]

**Tiyul institutu.** Bu şərti torpaq mülkiyyəti növünün məhz hansı əsrdə bərqərar olması barədə müxtəlif fikirlər vardır. İ.P.Petruşevskiyə istinad edən O.Ə.Əfəndiyev tiyulun XVl

[213] Azərbaycan tarixi, «Elm», lll cild, səh.109.
[214] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə ...,səh.76-78.



əsrdə soyurqalı əvəz etdiyini bildirmişdir.[215] Lakin V.F.Minorski teymurilər dövründə tiyul istilahının işlədilməsi ilə əlaqədar olaraq iqta mülkiyyətinin aradan çıxdığını söyləmişdir. Tiyul barədə ingilis alimi K.S.Ləmbtonun da bir-birinə zidd iki fikri vardır. O, gah tiyulun Səfəvilər dövründə iqtanı əvəz etdiyini, gah da elə elxanilər zamanı iqtanın tiyul ilə əvəz olunmağa başladığını qeyd etmişdir. Amma, məlum olduğu kimi, iqtanı əvəz edən institut tyul yox, soyurqal institutu olmuşdur.[216]

Tiyul müəyyən bir yerin müvəqqəti istifadə olunmasından ötrü şahın dövlət torpaqları hesabına xüsusi şəxslərə verdiyi sahəyə deyilirdi. Tiyul sahibi (tiyuldar) həmin torpaqdan alınan gəlirin hamısını, yaxud böyük bir hissəsini mənimsəyirdi. O, dövlətə hər il «rüsum» adı altında müəyyən məbləğ pul verməliydi. Bəzən tiyul müəyyən qoşun hissələri hazırlanması məqsədilə də verilir və tiyuldar lazımi vaxtda hökümətin sərəncamına əsgəri quvvə verməyə vəzifədar edilirdi. Tiyul soyurqaldan fərqli olaraq əmir, şahzadə və başqa şəxslərə irsən verilə bilməzdi, çünki bu torpaq mülkiyyəti növü məhz tiyula layiq görülən hökumət məmurunun etdiyi xüsusi xidmət müqabilində maaş kimi verilirdi.[217]

Xidməti böyük olan şəxsin tiyulu da böyük olurdu. 1406-cı ildə Qara Yusif Bəstam Cagirə əmirül-ümara vəzifəsini verdiyi vaxt Sultaniyyə, Ərdəbil və Muğan də tiyul kimi həmin əmirə xas idi.[218]

Dövlət başçısı müharibəyə yollanan vaxt tiyuldarlar da onunla həmrah olmalı, öz qoşunları ilə köməklik göstərməliydilər.

[215] О.А.Эфендиев. Образование Азербайджанского государства Сефевидов в начале XVI века, Баку,1961,стр.37.
[216] Ş.Fərzəliyev. Azərbaycan XV-XVl əsrlərdə ..., səh.79-80.
[217] Yenə orada, səh.80.
[218] Yenə orada.

Tiyulun ləğvi nəticəsində yaranan vahimə bu mulkiyyət formasının tiyuldar əmirlərdən ötrü nə qədər gərəkli olduğunu bariz şəkildə əks etdirir.[219]

Vergi və mükəlləfiyyətlərə gəldikdə isə, deməliyik ki, vergi sistemini və onun terminologiyasını öyrənən nisbətən çoxsaylı əsərlərin olmasına baxmayaraq, indiyə kimi bu sahədə bir çox məsələlər aydın deyil və həll olunmamışdır.

Vergilər, xüsusi vergiyığanlar – mühəssillər vasitəsilə toplanırdı. Onlar isə vergiləri müəyyən olunmuş miqdardan artıq yığmağa çalışırdılar. Vergilər əhalidən məhsul və pul ilə yığılırdı.[220]

Vergi yığımı barədə xüsusi «dəstur»lar /qanunlar/ mövcud idi. Şirvanşah Fərrux Yəsarın 1474-cü ildə Abşeron valisi olan oğlu Şamxal Sultan Məhəmməd Qazıyə Mahmudabadın da verilməsi xüsusundakı bir sənəddə vergi yığımı barədə aşağıdakı məsləhətlər vardır: «Onlar /dövlət məmurları – N.M./... divan vergilərinin toplanmasında rəiyyətlərlə sabiq dəstura və məlum qanun-qaydaya əməl edib... rəiyyətin məhsulunu mənimsəməsinlər. Onlara həvaləni yalnız cərimələri dəftərlə səbt olunmuş şəri və ürfi /mülki/ qayda üzrə sübut olunandan sonra... göndərsinlər»[221].

XV əsrdə əhalidən divanın və feodalların nəfinə yığılan 30-dan çox vergi növü olmuşdur. Onlardan aşağıdakıları göstərmək olar:

Malcehat, ixracat, şiltaqat, əvarizat, ələfə, ülufə, qonaqla, ulaq, ülam, biyar, savəri, peşkəş, səlami, eydi, novruzi, şilənbəha, rəsməl-möhr, rüsumi-daruğəgi və kəlantəri, rəsməl-vozəra, düşüllük, mirabi, dəhyeki-mustovfiyan, dəhyeki-soyurqal, dəhyeki-rəiyyəti, xırmanbəhrə, çuvallıq, çərik, cizyə, tərx, cıraqlıq, məvaşi, mərai, sərşümar, bəhayi-morq, sorğu, ximə, kəndəlik və s.[222]

---

[219] Ş.Fərzəliyev, Azərbaycan XV-XVI əsrlərdə, səh.81.
[220] Yenə orada, səh.81-82.
[221] M.Nemətova. Göst. məqalə, səh.68.
[222] İ.P.Petruşevski. XVI-XIX əsrin əvvəllərində..., s.265



Bu vergilərin bəziləri haqqında müxtəsər məlumat verməyi münasib bilirik:

**Malcehat**. Məhsulun müəyyən bir hissəsi kimi yığılan renta vergi növüdür. Bəzən müəyyən bir yerin malcehatı şəxsə məvacib əvəzinə verilirdi, amma bu vergi əsasən məhsul ilə ödənirdi (buğda, darı, düyü, pambıq, ipək və s.)[223] Bəzən isə müəyyən bir yerin malcehatı xüsusi xidməti olan şəxsə məvacib əvəzinə təyin olunurdu. Sübut üçün bu cümlə kifayətdir: «Bu yerin mal-o cehatı məvacib kimi İskəndər bəy Əfşara verilmişdi...»[224]

**İxracat.** Əyalətlərdəki döyüşçü və dövlət qulluqçularının ehtiyaclarını ödəməkdən ötrü əhalidən yığılırdı. Yaqub Ağqoyunlunun dövründə müvəqqəti olaraq ləğv edilən bu vergi növü barədə məlumat azdır. Bəzi hökmdarların hakimiyyəti dövründə müvəqqəti ləğv edilən ixracat barədə mənbələrdə müəyyən məlumat vardır. Məsələn, Yaqub Ağqoyunlu ixracatın bir hissəsini 886 (1481)-ci ildə ləğv etmiş, sonradan isə onun hamısı üzərinə qadağa qoymuşdur.[225] İxracat vəzifəli şəxslərin (dövlət məmurlarının) müəyyən dövlət tapşırığı ilə bir yerdən başqa yerə gedərkən onlara ödənilən vergi olmuşdur. Yaqubdan sonra Gödək Əhməd də həmin verginin ləğvi barədə fərman vermişdi.[226]

**Ələfə və ülufə.** Ələfə istilahı feodal qoşunlarındakı heyvanların yemlənməsindən ötrü toplanmışdır. Bu söz altında bəzən hökumətin tələbi ilə döyüşçülər üçün rəiyyətdən yığılan ərzaq da başa düşülür. Ülufə isə, vergiyığanlar, dövlət məmurlari və əsgərlər üçün toplanan vergi növü idi. Onlardan başqa, mənbənin göstərdiyinə görə «mütəvəlli, vəqf işçiləri, pişnamaz və azancılara da sədrlərin icazəsi ilə ülufə verilirdi.[227]

**Qonalqa.** Xarici dövlət nümayəndələrinin (elçi), şah qasidlərinin, ali rütbəli məmur və əyanların rəiyyət evlərində

---

[223] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə..., s.85.
[224] Budaq Qəzvini. Cəvahirəl-əxbar, vərəq 316 a.
[225] Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə..., səh.85.
[226] Yenə orada.
[227] Yenə orada. səh.84-85.

saxlanması (müvəqqəti olaraq) üçün çəkilən xərcləri ödəyən vergi idi.[228]

**Savəri.** Bəzi mənbələrdə «peşkəş» istilahı ilə birlikdə işlənir. «Könüllü verilən hədiyyə» mənasında da anlaşılır. Bu vergi bütün yüksək rutbəli dövlət məmurlarının qarşılanma və yola salınmaları zamanı onlara təqdim edilirdi.[229]

**Mirabi.** Bu istilah Yaqub Ağqoyunlunun 1479-cu ilə aid bir fərmanında verilir. Mirab-hərfən «su əmiri», yəni suvarma arx və kanallarının rəisi mənasını verir. Deməli, belə qənaətə gəlmək olar ki, suvarma üçün suyun düzgün bölüşdürülməsinə nəzarət edən məmur belə adlanmışdır.[230]

**Dəhyek.** – farsca «ondan bir» deməkdir və ərəbcə «üşr» («on») istilahının sinonimidir. Yığılan məhsulun mülkədar və məmurların xeyrinə ayrılan hissəsidir.[231]

**Bayramlıq.** Kəndlilərin mülkədarlara bayramlarda ödədiyi məcburi vergi növüdür. Bu vergi adətən dini bayramlar və novruz münasibətilə verilirdi. Qasım Ağqoyunlunun bir soyurqal sənədində həmin vergi «eydi» və «novruzi» kimi də qeyd olunmuşdur.[232]

**Çuvallıq.** Səciyyə etibarilə kəndli mükəlləfiyyətidir. Bu vergi növünə Əhməd Ağqoyunlunun 1497-ci il tarixli fərmanında təsadüf olunur. Azərbaycanda çuval sözündən yaranmış bu istilah, güman edildiyinə görə istər qoşunlarda, istərsə də divan vergi idarələrində mühüm əşya olan çuvalların tədarükü üçün düşünülmüşdür.[233]

**Kəndəlik.** Türk sözüdür və «divarda bürc ucaltmaq» kimi şərh olunmuşdur. Güman etmək olar ki, bu istilah qala bürclərinin tikintisi üzrə rəiyyət üzərinə qoyulan mükəlləfiyyətlərdən biri olmuşdur.[234]

---

[228] İ.P.Petruşevski. XVI-XIX əsrin əvvəllərində..., səh.274-275

[229] Yenə orada, səh.284-285

[230] O.Ə.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, səh.202.

[231] Yenə orada.

[232] İ.P.Petruşevski. XVI-XIX əsrin əvvəllərində..., səh.281.

[233] O.Ə.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, səh.203.

[234] Yenə orada, səh.204.



Əvvəlki və sonrakı əsrlərdə olduğu kimi XV əsrdə də kəndli və şəhərli əhali üzərinə qoyulan vergi növlərinin kəmiyyətcə çox olması feodalizm dövründə Azərbaycan və ona qonşu ölkələrdə hökm sürən zülmkarlığın aşkar təzahürüdür. Qasım Ağqoyunlunun 1498-ci ilə aid olan soyurqal sənədində 31 növ, Yaqub Ağqoyunlunun 1488-ci ilə aid olan vəqf sənədində isə 27 növ vergi və mükəlləfiyyət adı çəkilmişdir.[235]

Belə güman etmək olar ki, Ağqoyunlular dövründə vergi və mükəlləfiyyətlərin sayı Qaraqoyunlular dövrünə nisbətən daha çox olmuşdur. Yuxarıda adı çəkilən 1474-cü il Şirvan sənədində isə cəmi 5 vergi növünə işarə olunmuşdur, bu isə Şirvanda Azərbaycanın cənub dövlətlərinə nisbətən vergi və mükəlləfiyyətlərin az olduğuna dəlalət edir.

---

[235] İ.P. Petruşevski. XVI-XIX əsrin əvvəllərində..., səh.263-264.

## III FƏSİL:

## XV ƏSR AZƏRBAYCAN FEODAL DÖVLƏTLƏRİNDƏ HÜQUQUN İNKİŞAFINDA ƏSAS CƏHƏTLƏR

### *(MÜSƏLMAN HÜQUQU, UZUN HƏSƏN AĞQOYUNLUNUN «QANUNNAMƏ»Sİ)*

Orta əsrlər Azərbaycan hüquqşünaslığı və Azərbaycanda hüquq elminin inkişafı dedikdə ilk növbədə şəriət və onun elmi sahələri olan Quranın təfsiri, kəlam, fiqh və hədislərin öyrənilməsi barədə elmlər, onlar haqqında yazılmış əsərlər, müsəlman hüququnun müxtəlif dövrlərdə tətbiq edilmə xüsusiyyətləri başa düşülür. Məlumdur ki, VII əsrdə Ərəbistanın Məkkə şəhərində Məhəmməd peyğəmbər tərəfindən yaradılmış islam dini çox çəkmədən sivilizasiyanın mövcud olduğu ərazilərin əksəriyyətini öz əhatəsinə alıb həmin ərazilərdə yaşayan xalqları islamlaşdırdı. Artıq XI əsrdə islam dini İspaniyadan Mancuriyaya, İndoneziyadan Sibirə və Urala qədər olan geniş ərazidə hakim ideologiya idi.[236]

Başqa dinlər kimi islam da ilk növbədə öz dövrünün ictimai-iqtisadi şəraiti zəminində meydana gəlmiş, teokratik dövlətlərin yaranması tələbatına müvafiq olaraq təkallahlığı təbliğ etməklə bütün ideoloji və ictimai münasibətləri bunun üzərində qurмuşdur. Müsəlman hüququ isə həmin əsas üzərində yaranmış ictimai münasibətləri tənzim edirdi.[237]

XV əsrdə mövcud olmuş Azərbaycan Qaraqoyunlu, Ağqoyunlu və Şirvan dövlətlərində yaşayan əhali də ictimai münasibətləri müsəlman hüququnun qayda-qanunları əsasında nizama salırdı. Bu tələbata müvaviq olaraq Azərbaycanda hüquqçular – Quranın təfsirçiləri, kəlamçılar, fəqihlər, mühəddislər yetişmiş, mövcud ictimai münasibətləri tənzim edən hüquq əsərləri yazmış, hüququn və mədəniyyətin

---

[236] E.Cəlilov. Göst. əsər, səh.44.
[237] Yenə orada.



inkişafına böyük təsir etmişlər. E.Cəlilovun düzgün olaraq dediyi kimi, bu baxımdan orta əsr Azərbaycan hüququnu ümumi müsəlman hüququndan kənarda təsəvvür etmək mümkün olmadığı kimi, onun inkişafını da müsəlman hüququ və islam dini ideologiyasının yaranması və inkişafından kənarda təsəvvür etmək mümkün deyil. Orta əsr Azərbaycan hüququ, o cümlədən XV əsr hüququmuz da müsəlman hüququnun üzvi bir hissi olub mahiyyətcə heç bir cəhətdən ondan fərqlənməmişdir.

Ümumiyyətlə, hər hansı bir xalqın tarixi və mədəniyyəti öyrənilərkən onun ərazisində mövcud olmuş dövlətlər (bizim əhatə dairəmizdə Qaraqoyunlular, Ağqoyunlular və Şirvanşahlar), dövrə müvafiq ictimai-iqtisadi münasibətlər və həmin münasibətləri tənzim edən hüquq normaları, üstqurum kimi həmin normaların bazisə münasibəti araşdırılır. Təəssüflə qeyd etmək lazımdır ki, Azərbaycanın orta əsrlərdə yaşayıb-yaratmış hüquqşünaslarının əsərləri həmin şəxslərin zəngin bir irs qoyub getmələrinə baxmayaraq bu günə qədər öyrənilməmiş qalır.

Müsəlman hüququnu tədqiq edərkən ilk növbədə islamın əsas mənbəyi və nəzəri əsası olan Quranda toplanmış hüquq normaları, həmin normaların sonralar müsəlman fəqihləri tərəfindən inkişaf etdirilməsi, ictimai münasibətlərin tənzim edilməsi üçün bu normalara yanaşılması, qiymətləndirilməsi zəruridir.

XV əsrdə Azərbaycanda islamın sünni qolu şiə qoluna nisbətən güclü idi. XVI əsrdən başlayaraq şiə qolu genişlənməyə və ətraf dövlətlərə də yayılmağa başladı.

Məlum olduğu kimi Qaraqoyunlular şiə, Ağqoyunlular və Şirvan əhli isə əsasən sünniməzhəb olmuşlar. Şiəlik və sünniliyin yan-yana mövcud olduğu Qaraqoyunlu, Ağqoyunlu və Şirvan dövlətlərində göstərilən dövrdə heç bir ciddi dini ixtilaf zahirə çıxmamışdır.

XV əsrdə Azərbaycanda müsəlman hüququnu öyrənmək üçün həmin dövrdə hüququn ümumi inkişafını şərh etmək lazımdır.

Şəriət. Müsəlman hüququ ümumi şəkildə şəriət adlanan elmlər sistemində toplanmışdır. Bu söz ərəb dilində «su içiləcək yerə gedən yol» mənasındadır, ümumiyyətlə isə islam dini qanununun, Allah əmrlərinin və ehkamlarının məcmusudur. E.Cəlilova görə, buna görə də şəriət sözü ilə hökm sözü bir növ eyniyyət təşkil edir.[238]

XV əsr feodal dövlətlərində qazi və müftilər tərəfindən düzgün çıxarılmış hökmə «şəridir» deyilirdi. Padşahların müəyyən hökm və fərmanlarında da şəriətə əsaslanır, şəriət ehkamlarına uyğun olmayan hallar kəskin tənqid edilir, əhalinin şeyx və imamların məsləhətləri ilə oturub-durmaları nəzərə çatdırılırdı. Şirvanşah Fərrux Yəsarın məlum sənədində (1474-cü il) Şirvan ölkəsinin Gəştasfi və Salyan vilayətlərinin hakimi vəzifəsinə təyin olunan oğluna belə məsləhət verilir: «... həmin şəhər və vilayət sakinlərinin vəziyyətlərini ehtiyatla öyrənsin, əhalini narahat edən məsələləri axund və üləmalarla müzakirə etsin, .... əzəmətli seyidlər, kəramətli şeyxlər və xalq imamlarına izzət və ehtiram göstərsin, çünki onların şərafətli vücudlarının mübarəkliyi və nurlu xatirələrinin köməyi olmadan yer üzərində zəmanə əhlini nizam-intizamda saxlamaq mümkün deyildir.[239]». Bu sənəddə üləmalar «şəriət qanunlarının icraçıları» adlandırılmışdır.[240]

XV əsrdə şəriət hökmləri iki hüquqi şəxs tərəfindən verilirdi: mülki-siyasi hökmlər-hökmdar tərəfindən, ruhani hökmlər isə – şəriət icraçıları /seyid, qazi, axund və s./ tərəfindən.

Sünnilərdə şəriət hökmləri ibadət (Allah qarşısında qulluq), müamilət (mülki-hüquq məsələləri) və üqubət (cəza) kimi üç qismə bölünmüşdür, şiələrdə isə ibadət (iki tərəfli hüquqi münasibətlər), itaət (təktərəfli hüquqi münasibətlər)

[238] E.Cəlilov. Göst. əsər, səh.54.
[239] M.X.Nemətova. Göst. məqalə. səh.70.
[240] Yenə orada.



və ehkam (digər hüquqi hökmlər) kimi digər 3 bölgüyə ayrılmışdır.[241]

Fiqh sahəsində fəaliyyət göstərən üləmalar müctəhid adlanırdı. Müctəhidlər də üç dərəcəyə ayrılırdı: qanun yaradıcılığında, şəriətdə ictihad, məzhəbdə ictihad və müəyyən məsələlərin həllində ictihad müstəqilliyini özündə ehtiva edən müctəhidlər. Birinci dərəcəli müctəhidlər Quranı bütün cəhətlərdən şərh etməli və əzbər bilməli, bütün ehkamları, onun bölmələrini, hədisləri əzbər bilməklə onların Quran ehkamı ilə əlaqəsini və məzmununu dərindən bilməli, şəxsiyyətcə təmiz və saf olmalı, bütün şəriət elmlərini bilməli idi. İkinci dərəcəli müctəhidlər mənsub olduqları mənsəbin və inamın ardıcılları olub həmin məzhəbi inkişaf etdirməli, qanunları əzbər bilməli, Quran və təfsirini mənimsəməli, onları şərh etməyi bacarmalı idilər. Üçüncü dərəcəli müctəhidlər isə qanunları və Quranı əzbər bilməklə yanaşı onları şərh etməyi bacarmalı, fitva vermək iqtidarında olmalı idilər. Fiqh elmi ilə məşğul olub bu üç ictihad dərəcəsinə çata bilməyən ülamalar isə təqlidçi-müqəllid adlanırdı.[242]

Bəhs olunan dövrdə, yəni XV əsrdə dünyəvi hakimlər (Qara Yusif, Cahanşah, Uzun Həsən, Fərrux Yəsar və b.) tərəfindən şəriət hökmlərinin fəaliyyətini dayandıran və ya dayandırmadan ictimai münasibətləri tənzim edən qanunlar verilməsi də adi hal olmuşdu. Vergilər yığımı, dövlət idarəçiliyi sahəsində qanunlar çox vaxt dünyəvi hakimlər tərəfindən verilmiş, bu barədə şəriət ehkamı sadəcə olaraq əxlaq yuksəldici xarakter kəsb etmişdir. Ümumiyyətlə isə dünyəvi hökmdarlar ruhani fəqihlərlə qarşı-qarşıya gəlməkdən çəkinmiş, bəziləri islam dini ilə yaxından bağlı olduğundan dinə qraşı çıxmayaraq hətta onun qaydalarına daha çox yaxınlaşmağa çalışmış, hətta müəyyən hallarda islama uyğun olmayan vergiləri belə ləğv etmişdir. Bütün bunlara baxmayaraq müsəlman hüququ dövlətin siyasi, daxili idarəçilik, ticarət və maliyyə məsələlərinin həllində həlledici

[241] E.Cəlilov. Göst. əsər, səh.56-57.
[242] Yenə orada, səh 57-58.

mövqe tuta bilməmiş, bu sahələrdə qanunvericilik dövlət orqanlarına, ilk növbədə hökmdara bağlı olmuşdur. Hüquqda bu ikiliyin – dövlətlərin verdiyi qanunların və fiqhin mövcudluğunun nəticəsidir ki, bütün islam dövlətlərində o cümlədən Azərbaycanda XV əsrdə şəriət qaziləri ilə yanaşı dövlət qaziləri (mülki qazilər) də olmuşdur.

Şəriətin elmi ehkamının müfəssəl sübutlarından bəhs edən elm fiqh elmidir. Fiqhin əsas vəzifəsi şəriət ehkamını tədqiq etməklə hüquq normaları yaratmaq, müsəlman hüququnu sistemləşdirmək və onların tətbiqinə şərait yaratmaqdır. Müsəlman hüququnun müəyyən etdiyi qaydaların əsası 5-dir: vücub (zərurətlər), nədub (həm zəruri, həm də qeyri-zəruri qaydalar), qəbahət (xoşagəlməz əməllərə görə qaydalar), hörmət və nifrət.[243]

Müsəlmanın hərəkətləri də 5 yerə bölünür: Vacib əməllər, buna fərz əməllər də deyilir, yəni namaz qılma, xüms və zəkat vermə; müstəhəb əməllər, yəni bəyənilən əməllər (həccə getmə, sədəqə vermə və s.); mübah əməllər, yəni edilməsinə görə nə mükafat, nə də cəza verilməyən əməllər, məsələn, ticarət əqdləri, müqavilələr bağlamaq və s; məkruh əməllər, məsələn danışanda ədəbsiz sözlər işlətmə, ağsaqqallara qarşı etinasız olma və s.; haram əməllər – şəriətin cəzalandırdığı işlər, məsələn şərab içmə, adam öldürmə, zinakarlıq və s.[244]

İman şəriətin və islamın əsasıdır. İman iki yerə bölünür: etiqada iman; işlərə, əməllərə aid iman.

İmanın 6 şərti vardır: Allaha, onun mələklərinə, peyğəmbərliyə, kitablara, axirət gününə, xeyir və şərin Allahdan olmasına inam. İslamın özünün isə 5 şərti vardır: kəlmeyi-şəhadət, gündə 5 dəfə namaz qılmaq, oruc tutmaq, ildə bir dəfə əmlakının zəkatını vermək, ömürdə bir dəfə həccə getmək. Bəzi fəqihlər cahadı da buraya əlavə etmişlər.[245] Heç də təsadüfi deyil ki, böyük padşahlar, o cümlədən Əmir Teymur, İldırım Bayəzid, Uzun Həsən, Sultan

---

[243] E.Cəlilov. Göst. əsər, səh.61.
[244] Yenə orada, səh.61-62.
[245] Yenə orada, səh.62.



Məhəmməd böyük hərbi yürüşlərə başlamazdan əvvəl həmin hərəkəti şəriət ilə əsaslandırır, qazilər və müftilər fitva verir və rəsmən cahad elan olunurdu.

Şəri hüquqa görə sübutun 8 növü vardır: sübutun həyatiliyi, elmiliyi, eşidilməli, görülməli olması, iradi olması, qadir adam tərəfindən edilməsi, danışılmalı olması və qanun qüdrətinə inam.[246]

Müsəlman hüququnun, yəni fiqhin 4 əsas kökü vardır: Quran, Sünnə, Qiyas, İcma. Bu mənbələrin tədqiqi ilə «Üsul əl-fiqh» elmi məşğul olur. Ümumiyyətlə fiqh elmi iki hissəyə ayrılır: 1.Üsul əl-fiqh və 2. Füru əl-fiqh. Birinci – müsəlman hüququnun köklərindən, ikinci isə onun budaqlarından, yəni konkret hüquq institutlarından bəhs edir. Üsul əl-fiqh müsəlman hüququnun qaynaqları olan Quran, Sünnə, Qiyas və İcmanı təhqiq etməklə onlarda olan normaların düzgünlüyünü və yeni normalar yaradılarkən əməl edilməli qayda və prinsipləri müəyyən edir. Fiqhin mənbələrindən Quran və Sünnə heç zaman mübahisə doğurmamış, bütün məzhəblər tərəfindən qəbul olunmuşdur. Digər iki mənbə isə bəzi məzhəblər tərəfindən ya qəbul olunmamış, yaxud da qeyd-şərtlə qəbul olunmuşdur.[247]

Füru əl-fiqh isə ibadətdən, təharətdən (ruhun təmizliyi və bədənin təmizliyi), namazdan, orucdan, zəkatdan, həccdən və bunların hüquq normalarından bəhs edən elmdir.[248]

Bu deyilənlərdən məlum olur ki, XV əsr Azərbaycan feodal dövlətləri başqa Yaxın və Orta Şərq ölkələrində mövcud olan dövlətlər kimi müsəlman hüququ ilə idarə olunmuşlar. Bəzi hökmdarlar tərəfindən müsəlman hüquqşünaslığı dəyərli əsərlər, o cümlədən hökm, fərman, vəqfnamə, dəsturül – əməllər, qanunnamələr ilə zənginləşdirilmişdir. Biz onlardan birinə – Uzun Həsən Ağqoyunlunun «Qanunnamə» adlanan qanunlar məcəlləsinə öz münasibətimizi bildirmək istərdik:

---

[246] E.Cəlilov. Göst. əsər, səh.62.
[247] Yenə orada, səh.63, 78,80.
[248] Yenə orada., səh.135-159.

Hər şeydən əvvəl qeyd etməliyik ki, bu «Qanunnamə» çox güman ki, dövrümüzədək gəlib çıxmamışdır.

İ.P.Petruşevski yazmışdır ki, Uzun Həsən əhalinin rəğbətini qazanmaqdan ötrü müxtəlif fərmanlar vermiş, «Qanunnamə», yaxud vergi işlərinin qanunilәşdirilməsi və tənzimlənməsi barədə kitab hazırlamışdı. O, «Şərəfnamə» əsərinə istinadən bildirir ki, XVl əsrin sonlarında da Azərbaycanda həmin «Qanunnamə»dən istifadə edilirdi, lakin Uzun Həsənin vəfatından sonra onun qanun kitabının müxtəlif maddələri pozulmağa başladı.[249]

«Qanunnamə» barədə O.Ə.Əfəndiyevin birinci monoqrafiyasında da müxtəsər məlumat vardır.[250] «Azərbaycan Səfəvilər dövləti» kitabında isə yazılır: «Maraqlıdır ki, Uzun Həsənin qanunları Kiçik Asiyanın şərq vilayətlərində (onlar XVl əsrin əvvəlində Osmanlı imperiyasının tərkibinə daxil olduqdan xeyli sonralar da) də feodal münasibətlərinin normaları olaraq qalırdı»[251].

Uzun Həsənin «Qanunnamə»si barədə Cəfər İbrahimov da məlumat verib yazır ki, mərkəzi hakimiyyəti və inzibati aparatı möhkəmləndirmək, vergi sistemini tənzimləmək və dövlət xəzinəsinə vergi toplanışını artırmaqdan ötrü irəli atılan ilk addım «Qanunnamə» adlı qanunlar məcmuəsinin hazırlanması oldu ki, orada vergilər və onların yığılması barədə maddələr olmuşdur. «Təəssüf ki, o qiymətli abidə dövrümüzə qədər gəlib çıxmadı, amma orta əsr tarixçiləri Xandəmirin, Yəhya Qəzvinin və Şərəf xan Bidlisinin həmin əsər haqqında verdikləri məlumat olduqca azdır» yazan C.İbrahimov öz kitabını sovet hakimiyyətinin tüğyan etdiyi bir zamanda yazdığı üçün Uzun Həsənin «Qanunnamə»sinə marksist-leninçi baxımdan yanaşmış, həmin Ağqoyunlu padşahının ölkədə apardığı islahatların elə bir əhəmiyyəti olmadığını bildirmişdir.[252] Amma, XVl əsrin sonunda yazıldığı

[249] İ.P.Petruşevski. «Sbornik statey po istorii Azerbaydcana» kitabı, səh.153.
[250] O.Ə.Əfəndiyev. XVl əsrin əvvəlində..., səh.50-51.
[251] Yenə onun: Azərbaycan Səfəvilər dövləti..., səh.200.
[252] C.İbrahimov. XV əsrdə Azərbaycan ərazisində..., səh. 39-40.



tarixdən təxminən 120 il sonra da İraq, Fars və Azərbaycanda işlənməkdə olan Uzun Həsən qanunlarının kölgə altına salınması, təbii ki, oyektiv qiymət deyildir. Mənbələrin məlumatına görəsə, Uzun Həsən rəiyyətin qayğısına qalan bir padşah olmuşdur. Biz İ.P.Petruşevskiyə əsaslanıb yazmışıq ki, o «Qanunnamə» adlı bir sənəd hazırlamış, rəiyyətdən vergi yığılarkən feodal və dövlət məmurları tərəfindən sui-istifadə hallarının qarşısını ala bilmişdi.[253] Uzun Həsənin qanunları Şərqi Anadoluda «Həsən padşah qanunu» adı ilə məşhur olmuş, oranı ələ keçirən Osmanlılar çox-çox sonralar da həmin qanunları oralarda tətbiq etmişlər. Bu fakt həmin vilayətlərə aid olan təhrir dəftərlərinə edilən qeydlərdə açıq-aşkar təsbit edilir. Kəmax, Ərzincan, Bayburd, Kəlkit, İspir şəhərlərinin h.917 və h.937-ci illərə aid (miladi 1511 və 1530 – Ş.F.) «müfəssəl təhrir və ovqaf dəftərləri»ndə «səbt olunan» qanunlar məhz Uzun Həsənin «Qanunnamə»sinə əsasən yazılmışdır» məlumatını verən Ş.Fərzəliyev habelə türk tədqiqatçısı Fəxrəddin Kırzıoğlunun Türkiyə Baş Vəkalət arxivi sənədlərinə əsaslandığı məlumata istinad edərək bildirir ki, XV əsrin ll yarısında Diyarbəkir vilayətində olduğu kimi, XVl əsrin l rübündə Ərzincan vilayətində yerli xalqın çoxdan bəri alışdığı «bacü tamğa» vergiləri Uzun Həsəndən qalma «Həsən padşah yasarı»na əsasən toplanırdı. İlk Osmanlı təhrir dəftərində /h.924-m.1518/ yazılmışdır: «Məhsulati-qürra bər movcibi-qanuni Osmani və bacü tamğa bər mövcibi-Həsən padşah» («Şəhər və kəndlərdən yığılan vergilər Osmanlı qanunları, bac və tamğa isə Həsən padşah qanunları əsasında yığılırdı»).[254]

«Qanunnamə» barədə prof. Y.Mahmudlu da «Azərbaycan diplomatiyası» kitabında məlumat vermişdir. O, yazır: «...Uzun Həsən bir sıra islahatlar keçirdi. O, köçəri hərbçi əyanlara deyil, oturaq əhaliyə əsaslanmaq xətti götürdü. Cəmiyyəti yaşadan əsas istehsalçılar olan kəndlilərin, habelə

[253] Ş.Fərzəliyev. Azərbaycan və Osmanlı imperiyası..., səh.54.
[254] Yenə orada. səh.54.

sənətkarların vəziyyətini nisbətən yaxşılaşdırmaq və bununla da məhsuldar qüvvələrin canlanmasını təmin etmək məqsədilə xüsusi «Qanunnamə» hazırlatdı. Sonralar «Həsən padşahın qanunları» adı ilə məşhurlaşan, hətta bütün XVI əsr boyu qüvvədə qalan bu «Qanunnamə»yə əsasən kəndlilərdən alınacaq vergilər müəyyənləşdirildi və onların miqdarı dəqiqləşdirildi. Vergi yığımı nisbətən sistemə salındı. Vergiyığan məmurların özbaşınalığı azaldıldı. Kəndlilərin, sənətkarların vəziyyəti, müvəqqəti də olsa, yüngülləşdirildi. Nəticə etibarilə Uzun Həsənin qanunları ölkədə məhsuldar qüvvələri müəyyən dərəcədə canlandırdı; kəndli və sənətkarlardan alınan vergilərin birbaşa xəzinəyə axması təmin olundu. Dövlət iqtisadi cəhətdən xeyli qüvvətləndi».[255]

1996-cı ildə çap olunmuş "Azərbaycan tarixi" kitabının redaktoru və əsas müəlliflərindən biri olan professor Süleyman Əliyarlı da Həsən bəy Ağqoyunlu və onun "Qanunnamə"si barədə müəyyən məlumat verib yazır: "Tarixi qaynaqlarda Uzun Həsən "Sultanül-adil Həsən xan", "Sultanül-qalib Həsən Padişah" adlandırılır. Daxili siyasətdə Uzun Həsən mərkəzi hakimiyyətin güclənməsinə, hərbi əyanların özbaşınalığına qanunla sədd qoyulmasına , xüsusilə rəiyyət üzərinə düşən vergi, ödənc və mükəlləfiyyətlərin azaldılıb nizama salınmasına çalışdı. Bu sonuncuların sayını aydınlaşdırmaq, vergi və ödənc toplayan əyanların və məmurların özbaşınalığına son qoymaq üçün Uzun Həsən ayrıca bir "Qanunnamə" buraxdı. XV-XVI yüzillərin yalnız vergi sisteminin deyil, dövlətin bütün iç işlərinin qaydaya salınmasında dəyərli rol oynadı". (Bax: Azərbaycan tarixi, 1998, səh.321).

Uzun Həsən «Qanunnamə»sindəki qanunların mahiyyəti haqqında ümumi məlumatın olmasına baxmayaraq, həmin qanunların dəqiq hansı sahələrə aid olması məsələsi hələlik qəti şəkildə müəyyənləşməmişdir. Türk tədqiqatçısı Xəlil Yınancın fikrincə «Qanunnamə» osmanlılar zamanı şərq

---

[255] Y.Mahmudlu. Göst. əsər, səh.90.

[256] Azərbaycan tarixi, Bakı, "Azərbaycan" nəşriyyatı, 1996, səh.321.



vilayətlərinin ərazi və timar (torpaq – Ş.F.) qanunlarının əsası kimi Səfəvilərin də belə təşkilatlarının əsası olmuşdur. X.Yınanca görə onun qanunları «ərazi təşkilatı və timarlı sipahilər (torpağa bağlı əsgərlər) barəsində idi.[257]

C.Vudsa görəsə «Uzun Həsənin «Qanunnamə»si ticari, mədəni, cəzayi və vergi yasaları» idi.[258]

XV əsrin bu məşhur qanunlar kitabı barədə ən müfəssəl məlumatı biz prof. A.K.Rzayevin «Azərbaycanda siyasi-hüquqi təlim tarixinə dair oçerklər» kitabında təsadüf edirik. A.K.Rzayev yazır: «XV əsrin hüquqi aktları içərisində Uzun Həsənin «Qanunlar»ı mühüm yer tutur. Həmin qanunlar (1470-1477) təkcə Azərbaycanda deyil, həmçinin Ağqoyunlulara tabe olan ölkələrdə də tətbiq edilirdi. Çox təəssüf ki, o qanunlar dövrümüzədək gəlib çatmamışdır...

Uzun Həsənin qanunları əsasən aqrar xarakter daşımışdır. Həmin qanunlarda feodal və kəndli torpaqlarından yığılası vergilərin miqdarı göstərilir, qanun pozulması hallarında veriləsi cəzalar öz əksini tapırdı.

Uzun Həsənin «Qanunnamə»sindən bir neçə misal:

1) «Yüksək saray» dəftərxanasının kitabında adları qeyd olunan və mülk sahiblərinin xidmətində olan kəndlilərin öz torpaqlarını tərk etmələri qadağan olunur.

2) Kəndlinin xilmətə gedəcəyi yer bir günlük məsafədən artıqsa o, xidmətinə gedəcəyi feodala töycü verməkdən azad edilir.

3) Kəndli yalnız işlədiyi torpağın əkin-biçini qurtardıqdan sonra oranı tərk edib başqa torpaq sahələrində xidmətə gedə bilər. Əgər o bu qanunu pozarsa, qanunauyğun şəkildə öz sahibinə əlavə töcü verməlidir.

4) Torpaq sahəsini əkib-becərmədən sərbəst şəkildə başqa yerə köçən kəndli həmin torpağın becərilməsi üçün torpaq vergisi və töycü verməlidir.

5) Həddi-buluğa çatmış hər bir müsəlman olmayan şəxs xəzinəyə 25 ağca məbləğində ispənc vergisi ödəməlidir.*

---

[257] İslam ensiklopediyası, I cild, səh.266.

[258] C.Vuds. Göst. əsər. səh.186-187.

6) Əgər kəndlinin mal-qarası başqa kəndlinin bostan və əkin sahəsinə zərər yetirərsə, mal-qara sahibi cəzaya - 5 dəfə qamçılanmağa və 5 ağca cərimıəyə məruz qalmalıdır».[259]

A.K.Rzayev sonra yazır ki, Uzun Həsənin qanunları Azərbaycanda təxminən 85 il, yəni 1556-cı ilədək qüvvədə qaldı. 1556-cı ildə hakimiyyətə gələn Şah Təhmasib** yeni qanunlar kodeksi hazırladı. Adı «Dəsturül-əməli Şah Təhmasib» olan həmin qanunlar da, təəssüf ki, dövrümüzə qədər gəlib çatmamışdır. A.K.Rzayev Şah Təhmasibin qanunlarının 1617-ci ilədək qüvvədə qaldığını bildirir.[260]

Uzun Həsənin «Qanunnamə»si haqqında dolğun məlumat verən tədqiqatçılardan biri də Ş.M.Mustafayevdir. Onun «Şərqi Anadolu: Ağqoyunludan Osmanlı imperiyasına doğru» adlanan dəyərli kitabında Şərqi Anadolunun hüquq təliminin səlcuq, monqol və postmonqol ənənələrinin yerli hüquq normaları ilə qarışığından ibarət olması vurğulanır və deyilir ki, həmin təlimin kodifikasiyası (qüvvədə olan qanunların sistemə salınması) XV əsrin 70-ci illərində Ağqoyunlu dövlətinin başçısı Uzun Həsənin qanunvericilik fəaliyyətinin nəticəsində sonralar həmin regionun ilk Osmanlı əyalət hüquq qanunlarında (vilayət və sancaq qanunnamələri) öz əksini tapmışdı. Osmanlı hüquq elmi bu yolla Uzun Həsənin qanunvericiliyindən bəhrələnərək Şərqi Anadolu əyalətlərinin «yasa» adlanan qanunlarını hazırlamışdı».[261]

Məlum olduğu kimi, Şərqi Anadolu torpaqları XV əsrdə Ağqoyunlu dövlətinin qərb hissəsini əhatə edirdi. Uzun Həsənin qanunlar məcmuəsini təşkil edən «Qanunnamə» əsasında bu əsrin sonlarında və XVl əsrin l rübündə əhalidən yığılan vergilərin miqdarı və yığım qayda-qanunu müəyyən edildi, həmçinin tranzit karvan və daxili ticarətdən toplanan

---

* Ağca XV əsrdə Azərbaycanda işlənən pul vahididir. l misqal gümüş, həmçinin 12 ağca pul 1 dirhəmə bərabər idi. İspənc isə bostanlardan yığılan vergi olmuşdur. /Bax: A.K.Rzayev. Göst. əsər,səh.86/.

259 A.K.Rzayev. Göst. əsər, səh.86.

** Şah Təhmasib 1556-cı ildə yox, 1524-cü ildə hakimiyyətə gəlmişdir.

260 A.K.Rzayev. Göst.əsər,səh.86-87.

261 Ş.Mustafayev. Göst.əsər,səh.5-6.



vergilər tənzimlənmiş oldu. Osmanlı dövləti tərəfindən Uzun Həsən qanunları əsasında hazırlanmış olan kənd və şəhər əhalisinə aid qanunların təhlili bizim dövrə qədər gəlib çatmayan Uzun Həsən «Qanunnamə»sinin əsas cəhətlərinin bərpası üçün son dərəcə gözəl imkan yaratmışdır.

Öz kitabının «Əlavələr» hissəsində «Uzun Həsənə aid olan Şərqi Anadolu vilayətlərinin Osmanlı qanunları» başlığı altında 16 qanun dəftərinin rus dilinə tərcüməsini verən Ş.Mustafayev son dərəcə faydalı bir iş görmüş, həmin qanunları oxucu və tədqiqatçıların mütaliə və tədqiqinə vermişdir. Bu Osmanlı qanunlarının əksəriyyəti aşağıdakı cümlələrlə başlayır: «1518 (924)-ci il. Həsən padşah «Qanunnamə»sinə əsasən tərtib olunmuşdur.[262] Yaxud, «1518 (924)-ci il Mardin vilayətinin müfəssəl «Qanunnamə»sinin kənd və şəhər məhsullarından vergi toplanmasını tənzimləyən bölməsi Osmanlı qanunu əsasında, lakin adı çəkilən şəhərdə bac və tamğa vergisinin yığılması isə... Həsən padşahın qanununa əsasən tərtib edilmişdir.[263]

Bu qanun dəftərlərini mütaliə etdikdə məlum olur ki, 1516-1518-ci illərə aid Şərqi Anadolu kəndlərindən yığılan vergilər əsasən mövcud Osmanlı qanunları üzrə, Mardin, Xərput, Ərzincan, Kəmax, Bayburt və s. şəhərlərdən toplanan vergilər isə «Həsən padşah qanunları»na əsasən tənzimlənirdi. Amma 1540-cı ildə Sultan Süleyman Qanuninin əmri ilə bütün Şərqi Anadoluda tətbiq edilən Uzun Həsən dövrünün köhnə qanunları ləğv olundu və yalnız Rum (Osmanlı) qanunları qüvvəyə mindi və beləliklə də Şərqi Anadolunun osmanlaşmasının yeni mərhələsi başlandı.[264] Bu xüsusda qeyd olunmalıdır ki, Osmanlı dövlətindən fərqli olaraq İranda XVlll əsrin əvvəlində də Səfəvi sarayının xəzinəsinə daxil olan vergilərin miqdarı Uzun Həsən tərəfindən yaradılan qanunlar əsasında həyata keçirilirdi.[265]

---

262 Yenə orada, səh,149,152-159.

263 Ş.Mustafayev, Göst. səh.162.

264 Yenə orada, səh.141.

265 Yenə orada, səh.12.

Gənc tədqiqatçı Mirafərim Seyidovun gənaətinə görə Uzun Həsənin "Qanunnamə"sinin müstəsna əhəmiyyəti onda idi ki, burada vergi və mükəlləfiyyətlərin miqdarının dəqiqləşdirilməsi, vergi toplayanların zülm və özbaşınalığına son qoymaqla yanaşı, əhalinin dövlətə, hökmdara rəğbətini artırmış, vergi dəyən təbəqələrin baş verə biləcək qiyamlarının qarşısını almaq məqsədi güdmüşdür. "Qanunnamə"də vergi və mükəlləfiyyətlərin miqdarı yüngülləşdirilməyib, hətta kəndli ailəsində ailə üzvlərinin ildə üç gün biyara işləməsi nəzərdə tutulsa da, bu məcmuə vergi və mükəlləfiyyətlərin toplanılmasında feodal və dövlət məmurlarının qanundan kənara çıxmasının, hər hansı bir əlavə rüsum yığmalarının qarşısını aldı.

Nəticə etibarilə, ilk dəfə idi ki, 44 növ vergi, mükəlləfiyyət, həmçinin cərimələr haqqında qanunnamə verməklə Ağqoyunlu hökmdarı bu sahədə müəyyən qayda-qanun yaradılmasına nail ola bildi. Bu tədbir həm də ölkədə kənd təsərrüfatı, sənətkarlıq və ticarətin inkişafına təkan verdi, vergi verən təbəqənin həyat şəraitinin yaxşılaşmasına səbəb oldu. Təsadüfi deyildir ki, uzun müddət Osmanlı sultanları da Türkiyənin bir çox vilayətlərində tamğa və bac vergilərinin miqdarını həmin Qanunnamənin əsasında müəyyən edirdilər.» (Bax: Seyidov Mirafərim Nəzir oğlu. XV yüzillikdə Azərbaycanda dövlət və hüquq. Hüquq elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiyanın əlyazma nüsxəsi, səh. 95)

Beləliklə, fikrimizin yekunu kimi deyə bilərik ki, XV əsr Azərbaycan feodal dövlətlərində hüququn inkişafında əsas cəhətlər dövrün müsəlman hüququnun, həmçinin Uzun Həsənin əldə olmayan, lakin müəyyən maddələri məlum olan qanunları nəzərə alınmadan tədqiq edilə bilməz.



# NƏTİCƏ

Orta əsrlərin, o cümlədən XV əsrin bu və ya digər dövlətlərinin quruluşunun öyrənilməsi, təbii ki, Azərbaycan tarix və hüquq elmlərinin qarşısında duran son dərəcə mühüm və aktual bir problemdir, çünki bizim mövcud qanunlarımız illər boyu tərtib edilərkən, şübhəsiz, əbiq qanunların müsbət cəhətlərini özündə əks etdirmişdir.

XV əsr Azərbaycan feodal dövlətlərinin tarixinə həsr olunmuş onlarla elmi kitab və məqalə vardırsa da, dövrün Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin quruluşuna xüsusi həsr edilən tədqiqat əsəri hələlik yoxdur. Bu mövzunun hərtərəfli işlənməsi, bütövlükdə, əhəmiyyətli bir tədqiqat işi kimi dəyərləndirilməlidir.

Bu dərs vəsaitində məlum yüzillikdəki feodal dövlətlərimizin siyasi quruluşunun, mərkəzi və yerli idarəetmə orqanlarının, hərbi sistem və məhkəmə quruluşunun, əmlakın hüquqi vəziyyətinin, torpaq üzərində mülkiyyət formalarının, vergi və mükəlləfiyyətlərin, habelə hüququn inkişafının əsas cəhətlərinə xüsusi diqqət yetirilmiş, bundan ötrü mənbəşünaslıq, tarixişünaslıq və hüquqşünaslıq cəhətdən dəyərli olan bir sıra mənbə və tədqiqat xarakterli əsərlərə müraciət edilmişdir. Habelə XV əsr Azərbaycan feodal dövlətlərinin mərkəzi və yerli idarətmə orqanlarının fəaliyyət mexanizminin öyrənilməsi ön plana çəkilmiş, idarəetmə orqanlarının təsnifatı verilmişdir. Şah, şahzadə, lələ, əmiri-divan, sədri-əzəm, vəkil, vəzir, hakim, daruğə, möhrdar, pərvanəçi, mustovfi, münşiəlməmalik və s. dövlət vəzifələrinin araşdırılması əsas məsələlərdən biri olmuşdur. Əsərdə hərbi quruluş və məhkəmə sistemini xüsusi diqqət yetirilmiş, döyüşçü dəstələri /çərik/, qoşunun müxtəlif cinahları araşdırılmaqla yanaşı hərbi rütbə sahiblərinin hüquq və səlahiyyətləri müəyyən edilmişdir.

Məhkəmə sisteminə gəlikdə isə deyə bilərik ki, Azərbaycanın XV əsrdə mövcud olmuş hər üç dövlətində məhkəmə sistemi təxminən eyni tərzdə təşəkkül tapmışdı və müsəlman hüququna əsaslanırdı. Təsbit edilmişdir ki,

ümumiyyətlə müsəlman dövlətlərində dini hakimiyyət ilə dövlət hakimiyyəti bir-birindən ayrı deyildisə də, tədqiq olunan dövrdə dövlət hakimiyyəti XVl əsrə nisbətən güclü olmuşdur. Məsələn müəyyən hökmlərin çıxarılması və cəzaların verilməsində əsas və qəti söz qazilərin deyil, hökmdarın olmuşdur, eləcə də məhkəmə hökmlərini adətən ilahiyyatçı hüquqşünaslar deyil, nüfuzlu feodallar, tayfa başçıları, yüksək rütbəli əmirlər icra etmişlər. XV əsrin hər üç dövlətində hərbi quruluş və məhkəmə sistemi özlərindən əvvəlki dövlətlərin təcrübi xüsusiyyətlərinə əsaslanmışdı.

Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin iqtisadi quruluşlarının əsas xüsusiyyətlərinə gəldikdə isə deməliyik ki, həmin quruluşların şəriət qanunları əsasında formalaşdığı və əmlakın hüquqi vəziyyətinin fiqh elminin tələbatına müvafiq olduğu nəzərə çatdırılmışdır.

Araşdırılan dövrdə müsəlman hüququna görə torpaq sahibliyinin 5 əsas növü olmuş (dövlət torpaqları, hakim sülalənin şəxsi mülkləri, müsəlman-ruhani idarələrinin ixtiyarına verilən vəqf torpaqları, xüsusi mülkiyyətdəki torpaqlar və kənd icmalarının mülkiyyəti olan torpaq sahələri), ərazidə iqta, soyurqal və tiyul institutları fəaliyyət göstərmişlər. Qeyd olunmuşdur ki, ölkədə divanın və feodalların nəfinə yığılan 30-dan artıq vergi növü möv-cud olmuşdur. Bu vergi növləri Ağqoyunlu dövlətində çox, Qaraqoyunlularda nisbətən az, Şirvanşahlarda isə az tətbiq olunurdu.

Azərbaycan feodal dövlətlərində ictimai münasibətlər müsəlman hüququnun qayda-qanunları əsasında nizama salınırdı. Bu tələbata müvafiq olaraq Azərbaycanda hüquqçular – Quranın təfsirçiləri, kəlamçılar, fəqihlər, mühəddislər yetişmiş, mövcud ictimai münasibətləri tənzimləyən hüquqi əsərlər yazılmışdır. Müsəlman hüququnu tədqiq edərkən ilk növbədə islamın mənbəi və nəzəri əsası olan Quranda toplanmış hüquq normaları, həmin normaların sonralar müsəlman fəqihləri tərəfindən inkişaf etdirilməsi, adı çəkilən normalara ictimai münasibətlərin tənzimlənməsi üçün yanaşılması olduqca zəruridir.



Qeyd olunmalıdır ki, müsəlman hüququ ümumi şəkildə «şəriət» adlanan elmlər sistemində toplanmışdı. XV əsrdə şəriət hökmləri iki hüququ şəxs tərəfindən verilirdi: Mülki-siyasi hökmlər – hökmdar tərəfindən, ruhani hökmlər isə şəriət icraçıları tərəfindən verilirdi. Fiqh sahəsində fəaliyyət göstərən üləmalar isə «müctəhid» adlanırdı.

Bəhs olunan dövrdə dünyəvi hakimlər /Qara Yusif, Cahanşah, Uzun Həsən, Fərrux Yəsar və b./ tərəfindən şəriət hökmlərinin fəaliyyətini dayandıran və ya dayandırmadan ictimai münasibətləri tənzim edən qanunlar çıxarılması adi hal olmuşdu. Vergi yığılması və dövlət idarəçiliyi sahəsində qanunlar çox vaxt dünyəvi hakimlər tərəfindən verilmiş, bu barədə şəriət ehkamı sadəcə olaraq əxlaq yüksəldici xarakter kəsb etmişdir.

Bu deyilənlərdən məlum olur ki, XV əsr Azərbaycan feodal dövlətləri başqa Yaxın və Orta Şərq ölkələrində mövcud olan dövlətlər kimi müsəlman hüququ ilə idarə olunmuşlar. Bəzi hökmdarlar tərəfindən müsəlman hüquqşünaslığı dəyərli əsərlər, o cümlədən hökm, fərman, vəqfnamə, dəsturül-əməllər, qanunnamələr ilə zənginləşdirilmişdir ki, onlardan biri Uzun Həsənin «Qanunnamə»si olmuşdur.

Beləliklə, bir daha qeyd olunmalıdır ki, bizim tərəfimizdən qələmə alınan "XV əsrdə Azərbaycanda dövlət quruluşu" monoqrafisı bu sahədə yazılan ilk böyük həcmli əsərdir və o, imkan daxilində Azərbaycanın Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar kimi mövcud feodal dövlətlərinin dövlət və hüquq tarixinə dair elmi cəhətdən əhəmiyyətli olan müddəalarla əsaslandırılmışdır.

# GÖSTƏRİCİLƏR

## Şəxs adları

Şahin Fazil Fərzəlibəyli – 11, 16, 20, 21, 25, 26, 27, 28, 29, 33, 34, 35, 36, 37, 42, 43, 44, 45, 51, 56, 58, 59, 61, 62, 63, 64, 65, 67, 68, 73, 79, 80, 81, 82, 83, 93
Ullusunu - 5
Kuruş – 6
Strabon – 7
Ptolomey – 7
Cavanşir - 7
Varaz Tiridat - 8
İqrar Əliyev – 11
Solmaz Qaşqay - 11
Vaqif Piriyev – 11, 65
Seyidağa Onulluhi – 11, 12, 16, 21, 28, 32, 37, 46, 47
Cəfər İbrahimov – 11, 17, 18, 29, 92
Yaqub Mahmudlu – 11, 12, 16, 94
Məşədixanım Nemətova – 12, 16, 21, 48, 49, 82, 88
İ.P.Petruşevski – 12, 17, 18, 37, 79, 82, 84, 85, 92, 93
C.Vuds – 12, 95
A.K.Rzayev – 12, 13, 16, 96
Q.M.Kərimov – 12, 13, 16
E.Cəlilov – 12, 13, 69, 70, 71, 72, 75, 76, 86, 87, 88, 89, 90, 91
Oqtay Əfəndiyev – 12, 21, 77, 80, 81, 84, 92
Sara Aşurbəyli - 12, 13, 48
Sibel Özbudun - 12
Şükufə Məmmədova - 13
Şahin Mustafayev – 13, 96, 97
Əbubəkr Tehrani /Tihrani/ - 13, 21, 32, 34, 36, 43, 46
Uzun Həsən Ağqoyunlu – 13, 14, 15, 16, 20, 21, 23, 27, 28, 31, 36, 40, 43, 44, 48, 49, 51, 61,
Qazi Əhməd Qumi - 13
Rahilə Şükürova – 13
Baysunqur Ağqoyunlu – 14, 28, 31, 36, 40
Fərrux Yəsar – 14, 21, 26, 49, 69, 82, 88, 89, 101
Cahangir Mirzə /Uzun Həsənin qardaşı/ - 14, 15



Saray xatun - 14
Cahanşah Qaraqoyunlu – 14, 15, 25, 32, 38, 42, 43, 46, 49, 58, 62, 74,
Əhməd Ağqoyunlu /Uzun Həsənin nəvəsi Gödək Əhməd/ - 15, 36, 83, 84
Əmir Teymur – 17, 19, 20, 22, 23, 24, 26, 27, 29, 30, 32, 38, 39, 49, 50, 59, 60, 61, 65, 69, 70, 90
Qara Yusif Qaraqoyunlu – 19, 20, 21, 23, 27, 28, 30, 31, 33, 34, 49, 50, 58, 68, 69, 89, 101
Sultan Əhməd Cəlairi – 19, 20, 31, 50
Qara Məhəmməd Qaraqoyunlu - 19
Pirbudaq Qaraqoyunlu – 20, 28, 34, 46, 66
Faruq Sümer - 20
Qara Osman Ağqoyunlu – 20, 23, 73
Sultan Murad /Osmanlı hökmdarı/ - 20
İbrahim /şirvanşah/ - 21, 26, 37, 49, 58
Həsən bəy Rumlu – 21, 26, 28, 29, 31, 36, 37, 40, 42, 44, 45, 58, 67
Ənuşirəvan - 21
Ömər /xəlifə/ - 22
Hinduşah Naxçıvani - 22
Qara İsgəndər Qaraqoyunlu – 23, 34, 37, 49
Sultan Yaqub Ağqoyunlu – 26, 32, 40, 46, 49, 62, 66, 79, 83, 85
Sultan İldırım Bayazid – 26, 90
Tofiq Nəcəfli - 26
Şərəfəddin Əli Yəzdi – 27, 59
Uğurlu Məhəmməd Ağqoyunlu – 28, 52, 62
Məhəmmədi Mirzə Qaraqoyunlu - 28
Lələ Məhəmməd /Məhəmmədi Mirzənin lələsi/ - 28
Lələ Səfərşah /Məhəmmədi Mirzənin lələsi/ - 28
Əmir Qara /Pirbudaq Qaraqoyunlunun atabəyi/ - 28
Sufi Xəlil – 28, 31, 35, 39, 41, 55, 62
Budaq Qəzvini – 39, 83
Bəstam Cagirlu – 30, 32, 33, 81
Əmir Qaraman - 30
Taş bəy Mosullu - 31
Sultan Əbu Səid /teymuri hökmdarı/ - 31, 73, 78
Süleyman bəy Bicən – 31, 32, 36

Şah İsmayıl – 31, 55, 63
Şahəli bəy Pornak – 31, 62
Murtazaqulu xan Pornak - 31
Həsən bəy Şüküroğlu Pornak - 31
Rüstəm Ağqoyunlu – 31, 36, 49, 80
Fərrux bəy Pornak - 31
Xəlil Yınanc – 32, 94
Bayandur bəy Ağqoyunlu - 32
Sultan Xəlil Ağqoyunlu – 32, 47, 55, 56, 65, 66
V.F.Minorski – 33, 47, 56, 57, 87
Bayandur Cagirlu - 34
Əbülfət bəy Cagirlu - 33
Şeyx Nəcməddin Məsud - 35
Sultan Məhəmməd Fateh – 36, 52, 55, 61, 90
Eybə Sultan – 36, 54
Qasım bəy Pornak - 36
Sultan Murad /Uzun Həsənin nəvəsi/ - 36, 44, 55
Əlvənd Mirzə /Uzun Həsənin nəvəsi/ - 36, 43, 55
Məhəmmədi Mirzə /Uzun Həsənin nəvəsi/ - 36, 41, 42, 43
Lətif bəy - 36
Qiyasəddin Xandəmir – 36, 40, 42, 92
İskəndər bəy Münşi Türkman - 36
Şah İmadəddin Salman Deyləmi /Sultan Xəlil Ağqoyunlunun vəziri/ - 36
Qazi Bayazid /Şirvanşah I İbrahimin vəziri/ - 38
Seyid Mahmud /Qara İskəndər Qaraqoyunlunun vəziri/ - 38
Həsənəli Qaraqoyunlu /Cahanşahın oğlu/ - 37, 38, 74
Xacə Şəmsəddin /Həsənəli Qaraqoyunlunun vəziri/ - 38, 39
Fəzlullah Xunci /Xunəci/ - 38, 40, 41, 46, 56
Arayeş bəyim /Qara İskəndər Qaraqoyunlunun qızı/ - 38
Əlaəddin Sədiq Kecəci /Arayeş bəyimin vəziri/ - 38
Şeyx Məhəmməd Kecəci /Baysunqur Ağqoyunlunun vəziri/ - 38
Mirzə bəy Cunabadi /Gunabadi/ - 40
Qazi İsa /Uzun Həsənin sədri/ - 40, 41, 46, 73
Abdulla /Məhəmmədi Mirzə Ağqoyunlunun lələsi/ - 42
Xacə Mahmud Heydər /İsfahan hakimi/ - 43
Yadigar Məhəmməd /teymuri şahzadəsi/ - 43
Pəhlivan Şahi /daruğə/ - 45



Qazi bəy /Şirvan şahzadəsi/ - 45
Əbülfəttah bəy /Bakı qalasının daruğəsi/ - 45
Şeyx Əli Pornak /möhrdar/ - 45, 56, 61
İbrahim bəy Pərvanəçi - 46
Əmir Cəlaləddin Qutlu bəy /pərvanəçi/ - 46
Cəlaləddin Həsənəli bəy /pərvanəçi/ - 46
Şükrulla /Ağqoyunlu mustovfisi, Qazi İsanın babası/ - 47
Əli bəy Ağqoyunlu /Uzun Həsənin atası/ - 48
Məhəmməd Xəzinədar - 48
Məhəmməd Bukavul - 48
Əli Şirəçi - 48
B.Dorn - 48
Mehdi bəy /maliyyə məşvərətçisi/ - 48
Şamxal Sultan Məhəmməd Qazi bəy /Şirvanşah Fərrux Yəsarın oğlu/ - 48, 52
Xəlilullah /şirvanşah/ - 59
Şahrux /teymuri hökmdarı/ - 51
Katerino Zeno – 52, 57
Cozafa Barbaro – 52, 54
Amrozio Kontarini - 54
H.Zərinəzadə – 54, 55
Ə.Dehxoda - 55
Ə.Müntəzirsahib - 55
Osman Miranşahi /Ağqoyunlu əmiri/ - 55
Qara Piri Qacar /səfəvi əmiri/ - 55
Həsənəli ibn Şeyx Əli Möhrdar /muçi əmiri/ - 56
Hüseyn bəy Qaramani /muçi əmiri/ - 56
Seydi Əhməd bəy Pornak /muçi əmiri/ - 56
Şahməhəmməd bəy Duxarlu /muçi əmiri/ - 56, 61, 66
Ç.N.Seddon – 56, 67
Saru Pirə - 57
Şəmsəddin Əli /Şəki hakimi/ - 59
Kustandil /Konstantin/ - 59
Gavur İshaq /Ağqoyunlu əmiri/ - 62
Zeynal Mirzə /Uzun Həsənin oğlu/ - 62
Bayandur bəy Təvaçi /Ağqoyunlu əmiri/ - 62
İbrahimşah bəy - 62
Pir Əhməd Qaramani /Ağqoyunlu əmiri/ - 62

Məhəmməd bəy /Ağqoyunlu əmiri/ - 62
Süleyman bəy /Ağqoyunlu əmiri/ - 62
Əli Paşa /Ağqoyunlu əmiri/ - 62
Məhəmməd Bəkir Mirzə /teymuri şahzadəsi/ - 62
Zeynal Mirzə /teymuri şahzadəsi/ - 62
Müzəffər Mirzə /teymuri şahzadəsi/ - 62
Hacı bəy /Ağqoyunlu əmiri/ - 62
Rüstəm bəy /Ağqoyunlu əmiri/ - 62
Əli bəy Ağacəri /Cahanşahın böyük əmiri/ - 62
I Şah Təhmasib – 63, 96
Musa bəy /vərsaq tayfa əmiri/ - 63
Həsən Xəlifə /vərsaq tayfa əmiri/ - 63
Dürhəsən Xəlifə /vərsaq tayfa əmiri/- 63
Mustafa bəy /vərsaq tayfa əmiri/ - 64
Bayazid Cagirlu /Cahanşahın əmiri, Bəstam Cagirlunun qardaşı/ - 63
Əbülfəth bəy Cagirlu /Bayazid Cagirlunun qardaşı/ - 63
Yusif bəy ibn Xurşid bəy Təvaçi - 66
Məhəmməd Əlişir /Pirbudaq Qaraqoyunlunun təvaçisi/ - 66
Xəlil /Uzun Həsənin təvaçisi/ - 66
Qara Məlik /Sultan Xəlil Ağqoyunlunun təvaçisi/ - 66
Pir Məhəmməd /Cahanşahın təvaçisi/ - 67
Seyid Əhməd Tuqaçi - 67
Pirəli bəy Şahnisbi /Uzun Həsənin qəcərçisi/ - 67
Qasım Əmiraxur - 68
Çingiz xan - 69
Əbülqasim Hilli - 72
Qara Bayazid /Şirvanşah Xəlilullahın qazisi/ - 73
Qazi Bürhanəddin /şair, hökmdar/ - 73
Əlaəddin Əli /Ağqoyunlu qaziyi-əskəri/ - 73
Sultan Əbu Yusif /Cahanşahın oğlu/ - 79
Şeyx Səfiəddin Səfəvi - 79
Qazan xan - 79
K.S.Ləmbton - 81
İskəndər bəy Əfşar - 83
Qasım bəy Ağqoyunlu - 85
Məhəmməd peyğəmbər - 86
Yəhya Qəzvini - 92



Şərəf xan Bidlisi - 92
Fəxrəddin Kırzıoğlu - 93
Süleyman Əliyarlı - 94
Mirafərim Seyidov - 98

## İstilahlar

Qaraqoyunlu – 4, 5, 11, 13, 14, 15, 17, 18, 19, 20, 21…
Ağqoyunlu – 4, 5, 11, 12, 13, 14, 15, 16, 17, 18, 19, 20, 21…
Şirvanşahlar – 4, 5, 11, 12, 13, 14, 15, 17, 19, 21, 22…
Azat /feodal hakim/ - 7
Şinakan /kəndli/ - 7
Naharar /vali/ - 7
Qaxnamak /hüquqi sənəd/ - 7
Arşaqi sülaləsi – 7
Mihranilər /Mehranilər/ - 7, 8
Hazarapet /minbaşı/ - 7
Hramanatar /baş vəzir -/ - 7
Sparapet /baş komandan/ - 7
Sasanilər – 8
Şəhriyar /şəhər sahibi/ - 8
Payqospan /ətraf əyalətləri qoruyan şəxs/ - 8
Kahin – 8
Katib – 8
Amargar /məmur/ - 8
Dəstgird /feodal torpaq mülkiyyəti növü/ - 8
Xvastaq /feodal torpaq mülkiyyəti növü/ - 8
Zərdüştilik – 8
Məlik /mülk sahibi, hakim/ - 9. 35, 36
Amil /xəzinə məmuru/ - 8
Əmir – 9, 25, 29, 51
İqta – 9, 11, 78, 79, 80, 81
Mülk – 9, 11, 77
Vəqf – 9, 10, 11, 78, 79
İcma – 9
Sacilər – 9
Haşimi əmirliyi – 9
Salarilər – 9

Rəvvadilər – 9
Atabəylər dövləti – 9
Vəzir – 9, 10, 23, 36, 37, 38, 44
Atabəy – 9, 28
Divanxana – 9
Hacib /hökmdarın şəxsi xadimi/ - 9
Mustovfiəl-məmalik – 9, 10
Vali – 9
Hülakular – 9, 10
Çobanilər – 9
Cəlarilər – 9, 15, 19, 20, 22
Qurultay /dövlətin ali orqanı/ - 10, 18
Elxan /dövlət başçısı/ - 10
Əmirül-üməra – 10, 23, 29, 30, 31, 32, 63
Naib – 10
İnaq – 10
Bukavul /aşxana rəisi/ - 10, 45
Təvaçi /hərbi qüvvə toplayan böyük əmir/ - 10, 61, 65, 66
Yasovul – 10
Bəlarquçi – 10
Bəxşi – 10
Tümən – 10
Divan – 10, 11, 22, 23, 25, 37, 44, 58
Bitikçi – 10
Münşiəl-məmalik – 10, 46, 47
Nazir /xəzinə məmuru/ - 10
Xazin /xəzinə məmuru/ - 10
Hekəməl-məmalik /dövlət arbitrajı/ - 10
Bayerat divanı – 10
İmarət divanı – 10
Məsas divanı – 10
Qazi – 10, 23, 70, 71, 72, 73, 74, 75, 88, 90
Hakim – 10, 42, 43
İsfəhsalar – 10
Mütəsərrif – 10
Şəhnə – 10
Qələmi – 10
Müqənnən – 10



Mühəssil – 10, 82
Müəddil – 10
Müqatiə – 10
Divani /dövlət torpağı/ - 11
Xass, xassə /xüsusi torpaq mülkiyyəti/ - 11
İncu – 11
Cəmaəti /torpaq mülkiyyəti/ - 11
Xərac – 11
Bac – 11
Qopçur – 11
Təmğa – 11
İxracat – 11
Əvariz – 11
Bağbaşı – 11
Elxanilər – 15, 22
Səfəvilər – 17, 22
Dərbəndilər – 17
Əməvilər – 22
Abbasilər – 22
Eldəgəzlər – 22, 23, 25, 26, 35
Bəylərbəyi – 23
Yivə /qaraqoyunlu tayfası/ - 26
Barani, baranlu /qaraqoyunlu tayfası/ - 26, 50
Sədlu /qaraqoyunlu tayfası/ - 26, 50
Bayburtlu /qaraqoyunlu tayfası/ - 26
Vərsaq /qaraqoyunlu tayfası/ - 26, 63, 64
Oxlu /qaraqoyunlu tayfası/ - 26, 63, 64
Qaracadağlu /qaraqoyunlu tayfası/ - 26
Baharlu /qaraqoyunlu tayfası/ - 26, 63
Qaramanlu /qaraqoyunlu tayfası/ - 26, 63
Əlpavut /qaraqoyunlu tayfası/ - 26, 63
Cagirlu /qaraqoyunlu tayfası/ - 26, 63
Hacilu /qaraqoyunlu tayfası/ - 26
Ağacəri /qaraqoyunlu tayfası/ - 26
Bayramlu /qaraqoyunlu tayfası/ - 26
Dügər, dügərlu /qaraqoyunlu tayfası/ - 26
Bayandur, bayanduri /ağqoyunlu tayfası/ - 26, 50
Əfşar /ağqoyunlu tayfası/ - 26

Bozçulu /ağqoyunlu tayfası/ - 26
Bayat /ağqoyunlu tayfası/ - 26, 63
Qacar /ağqoyunlu tayfası/ - 26
Çəpəni /ağqoyunlu tayfası/ - 26, 63
Əmirlu /ağqoyunlu tayfası/ - 26
Əhmədlu /ağqoyunlu tayfası/ - 26
Şamlu /ağqoyunlu tayfası/ - 26, 64
Mosullu /ağqoyunlu tayfası/ - 26, 31, 63
Xunuslu /ağqoyunlu tayfası/ - 26
Pornak /ağqoyunlu tayfası/ - 26, 31, 63
Begdeli /ağqoyunlu tayfası/ - 26
Ərəbgirlu /ağqoyunlu tayfası/ - 26, 63
Eynallu /ağqoyunlu tayfası/ - 26
Bicənlu, bicən /ağqoyunlu tayfası/ - 26
Heydərlu /ağqoyunlu tayfası/ - 26
Təkəlu /ağqoyunlu tayfası/ - 26
Tabanlu /ağqoyunlu tayfası/ - 26
Düharlu /ağqoyunlu tayfası/ - 26
Ördəklu /ağqoyunlu tayfası/ - 26
Çavundur /ağqoyunlu tayfası/ - 26
Rumlu /ağqoyunlu tayfası/ - 26
Türkman /ağqoyunlu tayfası/ - 26, 55
Şixavənd /ağqoyunlu tayfası/ - 26, 63
Şahzadə – 27, 44
Lələ – 28, 42
Əmirdivan /sahib divan, divanbəyi/ - 32, 37
Vəkil – 35, 36, 37, 39, 45
Baş vəzir /etimadüd-dövlə/ - 36, 37
Sədr – 39, 44
Kutval – 43
Daruğə – 43
Möhrdar – 45
Mustovfi /maliyyə məmuru/ - 46, 47
Eşikağası – 46
Qapıçı – 46
Pərvanəçi /saray katibi/ - 46, 47
Xəzinədar – 46, 48
Mehmandar – 46



Çaşnigər yaxud bukavul /aşxana rəisi/ - 46, 48, 67
Quşçu /ov quşlarına nəzarət edən məmur/ - 46
Məşəldar – 46
Şirəçi yaxud ayaqçı /saray üçün şərab və şərbət tədarükündə məsul şəxs/ - 46, 48
Fərraş – 46
Cərrah – 46
Süfrəçi - 46
Vəzir – 50
Boy bəyləri /bayanduri bəyləri/ -50
Boy nökərləri /bayanduri əskərləri/ - 50
Çərik /hərbi dəstə/ - 51
Qibtəul /kiçik rütbəli qoşun başçısı/ - 51
Puşandar /ağır silahlı süvari qoşun/ - 51
Tirkəşbənd /oxatan əskər/ - 52
Çərxçi /çərxçigəri/ - 53, 56, 57, 58
Çərxçibaşı – 53, 57
Çərx /silah-/ - 53
Muçi /hərbiçi/ - 57, 58
Münqəlay, mənqəlay, pişdar /qoşunun ön hissəi/ - 57, 59, 62
Qulluqçu /hərbi xidmətçi/ - 58
Qurxanə /silah ambarı/ - 58
Kəcim /döyüş libası/ - 58
Surən /əskərlərin nərəsi/ - 58
Nəfir /şeypur/ - 58
Qəbrəqə /böyük nağara/ - 58
Kərənay /uzun zurna/ - 58
Tərh /ehtiyat qoşun/ - 58
İstimalətnamə /cəlbedici məktub, nəvaziş naməsi/ - 58
Yasaq /əskər yığımı/ - 58, 60
Cəvanğar /qoşunun, ordunun sol qolu/ - 59, 61
Bəranğar /sağ qolu/ - 59, 61
Qul /mərkəz/ - 59
Hiravul /ön dəstə/59 -
Çapavul /qoşun növü/ - 59
Şiqavul /qoşun növü/ - 59
Qarovul /kəşfiyyatçı/ - 61
Zəbangiri /dil tutmaq/ - 61

Əmire-bozorg, əmire-mötəbər /böyük əmir/ - 63, 64, 67
Əmire-kuçek, əmire-ordu /kiçik əmir/ - 63, 64
Qorçi /şah qoruyucusu/ - 65
Qorçibaşı – 65
Tugaçi /xəbər aparan, mühüm tapşırıqlar icraçısı/ - 67
Qəcərçi /axtarış aparan/ - 68
Nəqbəçi /lağım atan/ - 68
Əmiraxur – 68, 69
Yasa /qanunlar məcəlləsi/ - 69
Qaziye-islam /şəriət qazisi/ - 70
Qaziye-əcrim /mülki işlər qazisi/ - 70
Fiqh /şəriət qanunçuluğu/ - 70, 71, 72, 73, 76, 90, 91, 92, 102
Qaziye-əskər – 73
Əraziye-divani – 77
Əraziye-xassə /dövlət torpaqları/ - 77
Əraziye-movqufat /vəqf torpaqları/ - 77
Cəmaətiye-deh /kənd icma torpaqları/ - 77
Divane-məmalik /torpaq idarəsi/ - 77
Divane-xassə /torpaq idarəsi/ - 77
Soyurqal – 79, 80, 81, 82, 83
Tiyul – 79, 81, 82, 83
Ehkame-soyurqal /soyurqal hökmü/ - 79
Nişane-soyurqal /soyurqal sənədi/ - 79
Tiyuldar – 81
Malcehat – 82, 83
İxracat – 82, 83
Şiltaqat – 82
Əvarizat –82
Ələfə – 82, 83
Ülufə – 82, 83
Qonalqa – 82, 83
Ulaq – 82
Ülam – 82
Biyar /bigar/ - 82
Savəri – 82, 84
Pişkeş – 82
Səlami – 82
Eydi – 82



Novruzi – 82
Şilənbəha – 82
Rəsməl-möhr – 82
Rüsume-daruğəgi – 82
Rüsume-kəlantəri – 82
Rəsməl-vozəra – 82
Düşüllük – 82
Mirabi – 82, 84
Dəhyeke-mustovfiyan – 82, 84
Dəhyeke-soyurqal – 82, 84
Dəhyeke-rəiyyəti – 82
Xırmanbəhrə – 82
Çuvallıq – 82, 84
Çərik /vergi növü/ – 82
Cizyə – 82
Tərx – 82
Çıraqlıq – 82
Məvaşi – 82
Mərai – 82
Sərşümar – 82
Bəhaye-morğ – 82
Sorqu – 82
Ximə – 82
Kəndəlik – 82, 84
Bayramlıq – 84
Axund – 88
İbadət /Allaha xidmət/ - 88
Müamilət /mülki hüquq məsələləri/ - 88
Üqubət /cəza/ - 88
Üsuləl-fiqh /fiqhin bir hissəsi/ - 91
Füruəl-fiqh /fiqhin digər hissəsi/ - 91
“Qanunnamə” qanunlar məcəlləsi – 91, 92, 93, 94, 95, 96, 97, 101

## Coğrafi adlar

Azərbaycan – 4, 5, 6, 8, 9, 10, 11, 12, 13, 14, 15, 16, 17, 18, 19, 20, 21, 22…
Şirvan – 5, 11, 17, 20, 21, 23, 26, 36, 50, 58

Ön Asiya – 5
Amaday – 5
Gizilbunda – 5
Zigertu – 6
Mada – 6, 7
Manna – 6
Urmiyə – 6
İzirtu - 6
Atropatena – 7
Albaniya – 7, 8, 9
Sarmatiya – 8
Kaspi dənizi – 8
Adurbadagan – 9
Dərbənd – 10, 14
Sünik – 10
Arsax-Xaçın – 10, 11
Şəki – 10, 18
İran – 10, 16, 20, 52, 67
Amerika – 14
Türkiyə – 15, 95
Təbriz – 15, 20, 26, 32, 33, 37, 39, 47, 66, 67, 74, 80
Kürdüstan – 15
İraqe-Ərəb – 15, 51
İraqe-Əcəm – 15, 51
Xorasan – 15, 44, 70, 51
Qarabağ – 15, 42, 59
Gəncə – 15
Şəmkir – 15
Kür – 15
Mərkəzi Asiya – 18, 19
Kiçik Asiya – 18, 19, 93
Yaxın Şərq – 18, 19
Orta Şərq – 18, 19
Dəməşq – 19
Mavərənnəhr –20
İstambul – 20
Dunay – 22
Moldova – 22



Volaxiya – 22
Rumıniya – 22
Buxarest – 22
Krayevo – 22
Yassı – 22
Şamaxı – 25
Bərdə – 26
Bağdad – 31, 34, 40
Məşhəd – 31
Muğan – 31, 58, 81
Qaracadağ – 31
Əlincə – 34
Kirman – 36
Şiraz – 36, 46
İraq – 37, 43
Qaraağac – 41
İsfahan – 43, 44
Bakı – 45
Kabul – 45
Ərciş – 47
Qafqaz – 48
Salyan – 48, 49, 88
Gəştasfi – 48, 88
Mahmudabad – 48, 82
Gilan – 49, 50
Mazandaran – 69, 50
Sivas – 50
Gürcüstan – 50, 59, 80
Turan – 50
Rum – 50, 55
Məğrib – 50
Şam – 50
Misir – 50
Fars – 50, 93
Dəşti-Cete – 50
Dəşti-Qıpçaq – 50
Xarəzm – 50
Xütən – 50

Babilistan – 50
Baxtərzəmin – 50
Hindistan – 50
Venesiya – 51
Otluqbeli – 52, 61
Tehran – 52
Çaldıran – 57
Baroda – 56
Başkənd – 61
Qaraman – 63
Naxçıvan – 64
Muş – 66
Diyarbəkr – 79, 93
Quxbir /çay/ – 67
Nəsibin – 68
Mardin – 68, 96, 97
Ərdəbil – 81
Sultaniyyə – 81
Abşeron – 82
Ərəbistan – 86, 93
Məkkə – 86
İspaniya – 86
Mancuriya – 86
İndoneziya – 86
Sibir – 86
Ural – 86
Anadolu – 93, 96, 97
Kəmax – 93, 97
Bayburt – 93, 97
Kəlkit – 93
İspir – 93
Ərzincan – 97



# MÜNDƏRİCAT

Müəllifdən ______ 3

Giriş ______ 4-16

**I fəsil:** Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin siyasi quruluşu:

1. Mərkəzi və yerli idarəetmə orqanları (dövlət başçıları, idarəetmə orqanlarının təsnifatı).
2. Hərbi quruluş və məhkəmə sistemi ______ 17-74

**II fəsil:** Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar dövlətlərinin iqtisadi quruluşunun əsas xüsusiyyətləri (əmlakın hüquqi vəziyyəti, torpaq üzərində mülkiyyət formaları, vergi və mükəlləfiyyətlər) ______ 75-85

**III fəsil:** XV əsr Azərbaycan feodal dövlətlərində hüququn inkişafında əsas cəhətlər (müsəlman hüququ, Uzun Həsən Ağqoyunlunun "Qanunnamə"si ) ______ 86-98

Nəticə ______ 99-101

**Göstəricilər:**

Şəxs adları ______ 102-107

İstilahlar ______ 107-113

Coğrafi adlar ______ 113-116

**Naşir:** Babək Təhmasibi

**Korrektor:** Nazilə Fazil

**Texniki redaktor:** İlhamə Hacıyeva

**Dizayner:** Fəxri Nəsirov

*Şahin Fazil Fərzəlibəyli*

**XV əsr Azərbaycan dövlətlərinin quruluşu**

**Çapa imzalanmışdır: 12.05.2003.**
**Formatı: 60x84 1/16 Tirajı: 500 ədəd**
**Sifariş № 11. Həcmi: 7,5 çap vərəqi**

**Qiyməti: müqavilə ilə**

**"Elnur-P" mətbəəsində**